*Bu kitab "**Nəbi Xəzri.** Seçilmiş şeirlər, poemalar və pyes. Üç kitabda, I-II kitablar"* (*Bakı, XXI – Yeni Nəşrlər Evi, 2002*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.361'1 - dc 21**
**AZE**
**Nəbi Xəzri. Seçilmiş əsərləri.** İki cilddə. I cild. Bakı, "Lider nəşriyyat", 2004, 248 səh.

Müasir Azərbaycan poeziyasının tanınmış nümayəndələrindən olan Nəbi Xəzrinin bu kitabına xalq şairinin müxtəlif dövrlərdə qələmə aldığı şeirlər toplanmışdır. Ana torpağa bağlılıq, vətənpərvərlik, insana xas ən saf duyğuların tərənnümü – Nəbi Xəzri poeziyasının başlıca gücü-qüvvəti bundadır.
Lirik qəhrəmanın fəal həyat mövqeyi, hadisə və faktların sənətkarlıqla mənalandırılması, məzmun təzəliyi və forma mükəmməlliyinin təbii təqdimi kitabdakı şeirlərdə dolğun bədii əksini tapmışdır.

**ISBN 9952-417-19-3**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## NƏBİ XƏZRİ KƏHKƏŞANI

Yer kürəsində həyat həm üfüqi, həm də şaquli istiqamətdə yayılmışdır. Yer qabığı səthindən üç min metr dərinliyə qazılmış quyular vasitəsilə o mühitdə yaşayan bakteriyalar aşkar edilmişdir.

Yer səthində (torpaqda, suda, havada) və atmosferin yuxarı qatlarında mikroorqanizmlərə rast gəlinir. Yer səthinin üfüqi istiqamətində canlı aləm (suda, suda-quruda, quruda yaşayanlar) həyat sürür.

Deməli, İlahinin yaratdığı canlı aləm əlverişli mühitdə həm yerin dərinliklərinə, həm də göyün ənginliklərinə doğru inkişaf edir.

Buna uyğun olaraq insan təfəkkürü də nəinki Yer kürəsi, həm də kainat istiqamətinə yönəlir. İnsan düşüncələrinin əhatə dairəsi elmi-texniki tərəqqi işi ilə birgə genişlənir, yüksəlir, zaman və məkan daxilində məntiqi ardıcıllıqla inkişaf edir.

Nəbi Xəzri də müasir bəşəriyyətin tərkib hissəsinə daxil olan poetik təfəkkürlü bir şəxsiyyətdir. Ona görə də şairin poeziyasında həm doğma torpağa bağlılıq, həm də yerdən kainata nəzər salmaq qabiliyyəti vardır.

N.Xəzri yaradıcılığı üfüqi istiqamətdə bütün Azərbaycanı, Azərbaycan xalqını və onun ardınca dünya xalqlarını əhatə edir. Bu onun poetik yaradıcılığında qabarıq şəkildə öz əksini tapır.

N.Xəzriyə görə, azərbaycanlılar da bəşəriyyətin tərkib hissəsinə daxil olmuş yaxşı insanlardır. Bəşəriyyətdən təcrid edilmiş insanlar çıxdaşdırlar, həm də onlar qismən vəhşiliyi özlərinə həyat tərzi seçmiş canlılardır.

Şairin poetik yaradıcılığında sırf azərbaycanlılıqla yanaşı, bəşərilik də mühüm yer tutur. Bizcə, buna səbəb Nəbi Xəzri təbiətinin Azərbaycan mühitində yoğrulması, şairin dünya təcrübələrindən bəhrələnməsi və onların hər ikisinin bioqaynaqlanmasının nəticəsidir.

N.Xəzri yaradıcılığı Azərbaycanın saf mühitində yetişməklə bu mühitdə cəmləşib qalmamış, doğma Vətənin sərhədlərindən çox-çox uzaqlara doğru istiqamətlənmişdir.

Azərbaycanın xalq şairinin poeziya səsi Asiya, Avropa, Afrika, Amerika qitələrinə yayılmış və öz oxucularının yaddaşına həkk olunmuşdur.

Nəbi Xəzrinin poetik təfəkkürünün məğzində qloballıq durur. O qloballıq elə sadəliklə və poetik ustalıqla oxucuya çatdırılır ki, oxucu onlardan mənəvi qida alaraq fikri ərşə doğru ucalır. Burada şairin ustalığı yer səthində bir qarış Gölün (Göy Gölün) suyunu kainatı özündə əks etdirən qlobal miqyaslı aynaya və ya Azərbaycanda bitən hər hansısa bir möhtəşəm ağacı (Gəncə çinarını, xan çinarı, platanı və ya sırğalı çinarı) dar gündə bəşəriyyətin hər bir üzvünün istinad obyektinə çevirməsidir.

Həyatda hər bir insanın başına yaşla əlaqədar müəyyən hadisə gələ bilər. Məsələn, insanın gözü kor ola bilər, yaxud taqətdən düşdüyündən, sərbəst yeriyə bilmədiyindən hər hansısa bir əsaya və ya dayağa ehtiyacı ola bilər. Belə halda şair yıxılmaq ehtimalı olan insana dayaq nöqtəsi çinarı, gözləri kor olana yeni göz – kainat aynasını – gölü nişan verir. Lal olduqda isə şair Xəzər dalğalarının dili ilə danışmağı üstün tutur. Bütün bunlar onun daxili dünyasının poetik inikasıdır, şairin dara düşə biləcək insanlara verdiyi məsləhətdir. Fikir dünyasının zəngin xəzinəsi ancaq müdriklərə xasdır.

Nəbi Xəzri ana torpağa bütün varlığı ilə bağlıdır. Bu bioloji bağlılıqda insana xas olan ən saf duyğular durur. Onlardan biri də Vətəni sevməkdir, vətənpərvərlikdir. Vətənpərvərlik isə üstündə həyata gəldiyin, ayaq tutub yeridiyin, ilk dəfə gözünü açarkən baxdığın, qidalandığın, gözəlliyindən mənəvi zövq aldığın, insanları ilə birgə yaşayıb-yaratdığın dünyadır. Həyat vətənpərvərsiz, vətənpərvərlik isə həyatsız ola bilməz.

Bu baxımdan da Nəbi Xəzri vətənpərvərliyi özünə həyat meyarı kimi, insanların daxili aləminin özəyi kimi götürmüşdür.

N.Xəzri şerinin iki misrasında onun vətənpərvərliyinin canı, qanı, döyünən ürəyi, dərin düşüncəsi cəmləşmişdir. O yazmışdır:

*...Şair Nəbi son nəfəsdə*
*Bu torpağı qucub gedər!*

Bu iki misra şairin torpaq qədri bilməsinə, ona minnətdar olmasına və son nəfəsində ana torpağı bağrına basacağına, qucacağına şair sözü

verir. Bu söz hər birimizə, bu torpağa sadiq olanların hamısına, o cümlədən də mənə aiddir. Çünki Vətənə sadiq olan hər bir şəxs son nəfəsdə ana torpağı qucub getməlidir. Vətən torpağını qucmayıb dünyadan gedənlər doğma torpağa yaddırlar.

Burada görkəmli yazar Anarın müdrik Dədə Qorqudun dilindən dediyi: – Əgər torpaq becərilmirsə, onu qorumağa dəyməz; əgər qorumursansa, becərməyə dəyməz, kimi dərin mənalı, çoxəhatəli və sanballı fikri yada düşür.

Torpağı becərməli, qorumalı və son nəfəsdə torpağa sədaqət əlaməti olaraq onu qucub getməlisən. Əgər sən torpağı qucmasan, torpaq rəngini dəyişərək qaralacaq və səni öz qaralmış torpaq ağuşuna alacaqdır.

Nəbi Xəzri görüşlərimizdən birində dedi ki, biz keçmişə – tarixə qayıtmamalıyıq. Biz tarixi bu günə gətirməli və müasir düşüncə tərzindən ona baxmalıyıq. Bu səbəbdən də Nəbi Xəzri "Torpağa sancılmış qılınc" və "Burla Xatun" pyeslərini on üç əsr bundan öncədən bu günə – XX əsrin ikinci yarısına köçürmüşdür.

Məlumdur ki, son on illər ərzində Azərbaycan Respublikasının başına çox bəla gəlmişdir. Bu illərdə Azərbaycanın mərd oğullara, müdrik insanlara, bütün varlığı ilə vətənpərvər övladlara ehtiyacı olmuşdur. Bunu dərindən dərk edən şair tarixi həqiqətlərdən istifadə edərək xalqımızda vətənpərvərlik hissini, torpağa sədaqəti aşılayır və onu poetik dillə alovlandırır.

Şairin bu iş üslubunda üç önəmli cəhət vardır. Onlardan biri tariximizin 1300 illik yazılı yaddaşına – "Kitabi-Dədə Qorqud"a yeni can, yeni məzmun vermək; ikincisi, xalqın yaratdığı bu əsərlə müasirlərimizi yaxından tanış etməklə yanaşı, həm də onu təbliğ etmək; üçüncüsü isə, müdriklərin Vətənə sədaqət yolunu bugünkü nəsillərə açıqlamaq.

N.Xəzri tariximizin ən parlaq səhifələrini bu günə gətirməklə öz yaradıcılıq missiyasını tamlaşdırmış və ona yeni həyat arxacı vermişdir.

N.Xəzri öz poetik yaradıcılığına dərin fəlsəfi izahat verərkən deyir ki, hər hansı bir əsər (şeir, poema, pyes və s.) şairin təfəkkürünə daxil olursa və orada tədricən yetişərək püxtələşirsə o, şairin öz malıdır, öz təfəkkür məhsuludur. Təfəkkürdə yetişərək kağıza köçürülmüş əsər yalnız müəllifin deyil, xalqın, oxucuların malıdır.

Belə əsərlər işıq üzü gördükdən sonra müəllifdən ayrılaraq ondan asılı olmadan öz həyatını yaşasa da, heç də müəllifi əsərdən, əsəri isə müəllifdən tam ayırmır.

Hər bir əsərin yaşadığı müddətdə o əsəri yazmış şəxsin təfəkkür məhsulunu özündə yaşadır, müəllif dünyasını dəyişdikdə isə onsuz ömür sürür. "Dədə Qorqud" da, Nizami Gəncəvinin "Xəmsə"si də, Nəsirəddin Tusinin ulduzlar dünyası da onlarla dünyaya göz açsalar da, yaradıcıları ilə öz həyatlarını şərəflə yaşayırlar.

Bir neçə il öncə biz Nabranda olarkən 22-23 yaşlı bir cavan oğlan dövri mətbuatda dərc olunmuş beş-on şeiri ilə onun-bunun qabağına qaçır və "Mən şairəm" deyə döşünə döyürdü. Hələ şairliyin nə olduğunu dərk etməyən bu gənc döyə-döyə sinəsini qabartmaqdan başqa faydalı bir iş görmürdü.

Son vaxtlar dalbadal nəşr edilən şeir kitablarına müraciət etdikdə mən orada yadda qalan və poetik vurğusu olan ciddi bir yazı tapa bilmirəm. Lakin belə şeir kitablarının müəllifləri həyatda özlərini çox şux tutur, başı buludlara dəyir və bəzən də içi hava ilə doldurulmuş qovuqlar kimi ayaqları yerdən üzülərək havaya qalxırlar.

Bu qəbildən olan şairlərin bir çoxu ətraflarında kök salmış Nizami Gəncəvi, Füzuli, Şəhriyar, Hüseyn Cavid kimi klassikləri görmür və onların əsərlərinin məzmunundan xəbər tutmurlar. Buna görə də cəmi qırx gün ömrü olan efemer şairlər meydana gəlir və poeziya bostanına ziyanlı toxum səpirlər. Bu qəbildən olan şairlərin yaratdığı toz-dumana bir qrup aşağı səviyyəli oxucuların gözünə kül atılır, onlar Azərbaycanın poeziya möhtəşəmlərindən müvəqqəti də olsa uzaqlaşdırılırlar. Lakin müasir dövrdə gəldi-gedər şairlərin başı üstündə dayanmış tanınmış şairlərimiz onları layiq olduqları istiqamətə yönəldirlər.

Belə qüdrətli şairlərdən biri də Nəbi Xəzridir. Nəbi Xəzri bir şair kimi Azərbaycan poeziyasına səssiz-səmirsiz və həm də vaxt baxımından uzun illər ərzində daxil olmuş, kök salmış və tədricən özünün layiqli yerini tutmuşdur. Nəbi Xəzri Azərbaycan poeziyasına ehtiyatlı addımlarla, yazacağı əsərləri beyin süzgəcindən keçirə-keçirə, poetik fikirləri ağıl xəlbirində ələyə-ələyə, söz dünyasının incilərini seçə-seçə, məntiq qatları karvanında hər bir ifadəyə layiqli yer tapa-tapa gəlmişdir.

Şairin poeziyası Azərbaycan şeir dünyasının şirəsindən bəhrələnərək özünə əsilli-köklü bir yer tapmışdır. Bu səbəbdən də Nəbi

Xəzri Nizami poeziya bayrağı altında özünəməxsus Nəbi Xəzri poeziya bayrağını sancmışdır.

Mən şair ruhlu xalqımızın ləyaqətli oğlu Nəbi Xəzrinin poeziyasını sevir və onun müəyyən məqamlarını təhlil etməkdən mənəvi zövq alıram.

Poeziyadan danışmaq, ona öz oxucu münasibətini bildirmək daim mənə mənəvi qida vermiş və təfəkkür dünyamı zənginləşdirmişdir.

Mən N.Xəzri poeziyasına müraciət etmiş, son həddə "Xuda Nəbisi", "Bahar köklü xəzan" və "Qəm dəftərini oxuyarkən" adlı publisistik yazılarla çıxış etmişəm. Bu yazılar mənim bir oxucu kimi şair Nəbi Xəzriyə olan razılığım kimi qəbul edilməlidir.

***Budaq Budaqov***
*Akademik*

## SÖZ

Əzəl başdan açarıdır sirlərin,
Öz gücünü ürəklərdən alar söz.
Ümid verər, sevinc verər, qəm verər,
Müşkül olan dərdə çarə qılar söz...

İlk həmdəmdir, ilk silahdır hər kəsə,
Əgər ki, o saf poladdan deyilsə.
Hər kəlməsi öz yerində deyilsə,
Qılınclardan daha kəskin olar söz.

Söz ucaldar bu cahanda insanı,
Əzizləyər bu cahan da insanı.
Vaxt olar ki, bircə anda insanı,
Əlli ilin hörmətindən salar söz.

Çalış, Nəbi, gecə-gündüz yarat sən,
Bəd sözləri öz sinəndən yar, at, sən.
İnci seçib, dürr toplayıb yaratsan,
Səndən eldə bir nişanə qalar söz.

*1944*

# ÇİÇƏK

Bu gün gözlərimə dəydi bir çiçək,
Yarpağı bəzəkli, rəngi səhərtək.
Onu mən uzaqdan görürkən, düzü,
Qopdu dodağımdan "gözəldir" sözü.

Mən ona yanaşıb baxdığım zaman,
Özüm də sözümə oldum peşiman.
Deme, saxta gülmüş o zərif çiçək,
Yarpağı bəzəkli, rəngi səhərtək.

Canlandı qarşımda, nurani üzlü,
Əziz, mərhum babam dodağı sözlü;
Elə bil söylədi yenidən bu an:
"Zahirə aldanma baxıb uzaqdan".

*1944*

## KİM DEYƏR?

Dəyəndə gözümə o qız, o afət,
Qəlbimi dindirən lal baxışıdır.
Gəlir sıxıntılar...
Gedir cəsarət...
Bəlkə də görüşdən xəyal yaxşıdır!

Lakin onu bir an görməyəndə mən,
Sönüb gözlərimdə qaralır cahan.
Yenə də ağrılar qopur ürəkdən,
Deyirəm: əzizim, gəl, gəl, hardasan!

Kim deyər, nədəndir bu ağrı, sızı,
Niyə iztirablar keçirir ürək?
Eşqimin sultanı – o gözəl qızı
Həm görmək istərəm, həm də görməmək.

*1945*

## KUZƏ

Noldu, ehtiyatsız yenə dolandın,
Bulaqda kuzəni sındırdın dünən.
Sonra baxıb ona hayıfsılandın,
Bir ağrı hiss etdim ürəyimdə mən.

Sənin yadındamı, mən ki, bir zaman,
Vermişdim sevgimi sənə ərmağan.
Onda de, ey gözəl, bu kuzə kimi,
Sındırdın eşqinlə vuran qəlbimi.

Nədir məna dolu bu əsrar görən?
Cansız bir kuzəyə acıyan insan,
Azacıq bir ağrı duymayır nədən,
Sevən bir ürəyi sındıran zaman?!

*1944*

## YADINA DÜŞSÜN

Hər gün küçənizdən keçdiyim zaman,
Eyvana çıxdığın yadına düşsün.
Bahar axşamları tər bənövşəni,
Köksünə taxdığın yadına düşsün.

Ürəyim gəlmir ki, qınayım səni,
Belə tez unutmaz sevən sevəni.
Axşam bulaq üstdə gözləyib məni,
Yollara baxdığın yadına düşsün.

Sərin meşə yolu nura boyandı,
Sən getdin, ürəyim atəşə yandı.
Kəsdiyin peymanı, verdiyin andı
Daşlara çaxdığın yadına düşsün.

*1953*

## SALXIM SÖYÜDLƏR

Doğma kəndimizdə bağ-bağça saldıq,
Yazda, qışda onun qeydinə qaldıq,
Çinarlar ucaldı arzumuz təki,
Boy atdı qovaqlar, şamlar,
bir də ki,
Sular kənarında salxım söyüdlər...

Səninlə ilk dəfə gəldik bu bağa,
Döndü ürəyimiz sevincdən dağa.
Görüşdük elə xoş, sakit yerdə ki,
Sən oldun, mən oldum,
bir də, bir də ki,
Sular kənarında salxım söyüdlər...

Aldı öz qoynuna budaqlar bizi,
Açdıq bu yerdəcə ürəyimizi.
Bir sirlik qalmadı bizim sirdə ki?!
Mən dedim, sən dedin, bir də, bir də ki,
Sular kənarında salxım söyüdlər...

Hayana yollansam, hayana getsəm,
Dağlara dırmansam, arana getsəm,
Yenə də hər zaman ürəyimdəki
Sənsən, eşqimizdir,
bir də, bir də ki,
Sular kənarındakı salxım söyüdlər...

*1954*

## DİNLƏ TƏBİƏTİ

Axşamdır...
Dərədən sürünür bulud...
Susan göy meşələr,
şiş qayalardır.
Gör, nələr danışır o qərib sükut,
Bəli, sükutun da öz dili vardır.

Dinlə, meşədəki bulaq nə deyir,
Baxma ki, süzülür o gilə-gilə.
Hər sözü bir böyük qərinə deyir,
Əsrlər danışır onun dililə.

Əsən meh nə deyir?
Bəlkə deyir ki,
Sərin yaylaqların nəfəsiyəm mən.
Büllur şeh nə deyir?
Bəlkə deyir ki,
Parlaq ulduzların danəsiyəm mən.

Dağlara səs düşsün, çöllərə səda,
Gurlayan sellərin
dinlə səsini.
Çaylardan içdiyin bir ovuc su da
Sənə pıçıldasın tarixcəsini.
Çaylar göy dənizi qoy qucaqlasın,
Bu dünya durduqca
qalasıdır o.
Kükrəsin şəlalə, coşsun, çağlasın!
Dağların ərköyün balasıdır o.

Gəlsin qulağına qovağın səsi,
Onlar ki, mənalı bir nəğməkardır.
Hər sınan budağın öz ah-naləsi,
Hər solan yarpağın öz dərdi vardır.

Məst olsan meşənin şirin sözüylə
Könlündən nə böyük sevinclər axar.
Bəlkə bir maralın ala gözüylə,
Sənə bütün gözəl təbiət baxar.

Yatsan göy çəməndə,
göy otlar üstdə,
Alacaq dövrəyə lalələr səni.
Dinməzsən, baxarsan qulağı səsdə,
Təbiət, gözəllik lal eylər səni.

O göl sahilinə gələn qıza bax,
Sanki budaqlar da ona əl edir.
Nə qədər gözəlsə bu meşə, bu dağ,
İnsansız təbiət yetim kimidir.

*1956*

## HAY VERİN, GÖZƏLLƏR!

Yetimdir dünyada
Kim qalsa yalqız,
Aylara çevrilir
Gün aram-aram.
Vaxt vardı siz məni
Axtarardınız,
İndi mən axtarıb
Sizi tapmıram.

Hay verin gözəllər, hara getdiniz?
Vurub ürəyimə yara, getdiniz!

Sükutu nəğmə tək
Durub dinlərəm,
Həsrətəm xoş söhbət,
Xoş qılıq üçün.
Bir zaman görüşə
Tələsənlərim,
Niyə tələsdiniz
Ayrılıq üçün?

İllər saçlarıma
Yağdı qar kimi,
Yoxsa çiçəklər tək
Siz də soldunuz?
Bəlkə də köçəri
Durnalar kimi,
Ayrı ürəklərə
Uçub qondunuz?

Yox, yox, incimirəm
Bu gün heç kimdən,
Mənə bəxş etdiniz

Göyü, yeri siz!
Şikayət etmirəm
Öz taleyimdən,
Sizsiniz taleyin
Əsil nuru, siz!

Hayana getsəniz parlayın, yanın;
Böyük tarixi var ötən hər anın!

*16-17 dekabr 1999*

## GÖZƏL QOCALIRSA...

O, gəldi, baxışlar
Qəmli, pərişan.
Baxdım, ürəyimdə susdu fəryadım.
Onu yuxu kimi gördüm bu axşam,
Fəqət gördüyümə mən inanmadım!

Saçlar ağ xəyaldı
Çiyni uzunu,
Üzündə qırışlar naxış-naxışdı.
Ancaq gözlərindən tanıdım onu,
Həyat tək gözlərə toxunmamışdı.

Günlər ilə dönüb
Səf-səf düzəldi,
Sanki Günəş doğdu uzaq səhərdən.
Onda o, gözəldi, necə gözəldi,
Elə bil gəlmişdi əfsanələrdən.

Bir dünya yaşardı
Məhrəm səsində,
Hər görüş – böyük bir ehtiyac kimi,
O elə adlardı Yer kürəsində
Günəş başı üstdə zərli tac kimi!

Dalğalar önündə
Körpə quzuydu,
Gözələ vurulan səmadı, yerdi.
Sanki o parlayan Dan ulduzuydu,
Gələn səhərlərdən müjdə verərdi.

Gözəllik ən ulu bir həqiqətdir,
Ürək həqiqətə həsrət deyilmi?
Gözəl doğularsa – bu səadətdir,
Gözəl qocalırsa – dəhşət deyilmi?

O, indi elə bil səssiz haraydır,
Qoy əssin üstündən ətirli yellər,
Axı gözəllərin camalı Aydır,
Aya necə qıydı rəhmsiz illər?

Təbiət!
        Sən bizə doğma, əzizsən!
Söylə doğrudanmı ədalətsizsən?

Məyər sən əsdikcə
                Vaxtsız küləklə,
Arzuya çatırsan ulu təbiət?
Axı gözəlliyə qəsd eləməklə,
Günaha batırsan ulu təbiət!
Möcüzə yarat ki,
                Tanrı, cahanda,
Gözəl gözəl qalsın qocalanda da.

*30–31 dekabr 1996*

## TÖKÜLƏRSƏ...

Arzular baharda, ömür qışdadır
Quru haray çəkər, yaş tökülərsə,
Ağıl yaşda deyil, ağıl başdadır,
Başın nə günahı saç tökülərsə.

Bəzən coşub-daşan səmum olarsan,
İllərdə əriyib sən mum olarsan.
Dünya ləzzətindən məhrum olarsan,
Ağzın nə günahı diş tökülərsə.

Namərd eləməyin qovaraq mərdi,
İnam xəyanətə köksünü gərdi.
Göydən dərin olar yerlərin dərdi
Ulduzlar yerinə daş tökülərsə.

Nəbini ah boğar, aman ağladar,
Həsrət də, nisgil də yaman ağladar.
İnsan qədir bilməz, zaman ağladar,
Gözün nə günahı yaş tökülərsə.

*8 aprel 1995*

## DÜNƏNDƏ QALDI

Görən hara uçdu
                    Şaqraq gülüşlər,
Ümidlər xəyala dönəndə qaldı?
Titrək həyəcanlar,
                    Doğma görüşlər
Əlim yetişməyən dünəndə qaldı.

İlkin məhəbbətin
Odu, atəşi,
Eşqim bir ürəkdə sönəndə qaldı?
Nə tez qürub etdi sevgi günəşi,
Nuru, hərarəti dünəndə qaldı.

Təbiət! Nə böyük sehirlərin var,
Nə verdinsə yenə o səndə qaldı,
Verəndə nəcibsən,
Alanda qəddar,
Deyən səxavət də dünəndə qaldı.

İllər kəmənd imiş
İnsan boynunda
Ömrü dara çəkmək kəməndə qaldı?
Zamanın amansız, namərd oynunda,
Nə vardı, nə yoxdu dünəndə qaldı.

Noldu düzə düşən
O qoşa izlər,
Ot basdı, saralmış çəməndə qaldı.
Gözlər eynəklərdən mərhəmət gözlər,
Gözlərin şövqü də dünəndə qaldı.
Yatırdın, oyandın
Bəlkə sən, şair
İllərin oxları sinəndə qaldı.
Bu günə keçdinmi görəsən, şair,
Bəlkə bu günün də dünəndə qaldı?

*20 sentyabr 1996*

## QƏLBİMDƏ SALAM VAR ANA XƏZƏRDƏN

*Türkiyədəki Elazığ şəhərinin yaxınlığındakı*
*Xəzər gölünə müraciət*

Yol alıb ən qədim qərinələrdən
Gəldim babaların doğma elinə.
Qəlbimdə salam var ana Xəzərdən –
Xəzərin övladı Xəzər gölünə!

Keçdi karvan-karvan ərlər, ərənlər
Yollarda açdılar min-min səhəri.
Vətəndən – Vətənə köçüb gələnlər
Özüylə gətirdi doğma Xəzəri.

Nəsillər bu yerdə
Xəzərli oldu,
Xəzər ağır gündə
təsəlli oldu.

Burda əl-üzümü yudum bir səhər,
Sular Xəzər kimi gördüm duz dadır.
Göllər şirin olur, dünyada göllər,
Bunun şirinliyi doğmalıqdadır.

Haçan nurlu axşam yerlərə düşür,
Ayın saf nurunda alışır Xəzər.
Parlaq ulduzlarda gözlər görüşür,
Xəzər övladıyla danışır Xəzər:
– Necəsən?
– Yaxşıyam!
– Yaxşı ol, bala!
Yellər səndən gələn xeyir xəbərdir.
– Sən sonsuz dəryasan, mən kiçik damla
– Xəzər damlası da Xəzər qədərdir.

Doğmadır göy düzlər,
                    şiş qayalar da,
Dillənir gur çaylar məhrəm sözüylə.
Tək Xəzri küləyi çatmırdı burda
Onu da gətirdi Xəzri özüylə.

*21 may 1996*

## ASİMAN ALTINDA, TORPAQ ÜSTÜNDƏ

Qalın buludlardan
          çıxdı dağ, qaya,
Əridi duman da
          torpaq üstündə.
Bir insan arzusu
          gəldi dünyaya,
Asiman altında,
          Torpaq üstündə.
O necə nəğməydi
          axdı cahana,
İlk layla dilləndi
          torpaq üstündə;
Yer idi, göy idi, –
          günəşdi ana,
İnsan "ana" dedi –
          torpaq üstündə.
Parladı yolunda
          lalə-çıraqlar,
İnsan baxdı yenə
          torpaq üstündə.
Qayadan qaynayan
          şəffaf bulaqlar,
Hopdu ürəyinə
          torpaq üstündə.
Burda öz sözünü
          nəğməylə deyər,
Qəlbləri aç, dindir, –
          torpaq üstündə.
Mavi göylərəsə
          Qoyma, göz dəyər –
Göylər şüşədəndir
          Torpaq üstündə.
"Mən gələndə göy idi,
          Qarabağın söyüdü".

Mənim torpağımdır –
Mənim torpağım.
İnsan sönməz nurdur
torpaq üstündə.
– Qara bağlamasın
Qoy Qarabağım,
Qürurla o durdu
torpaq üstündə.
Vətən taleyini
yazırdı İnsan,
Torpaqdı var-yoxu
torpaq üstündə.
Hər gün ölümə də
hazırdı İnsan,
Bir gün doğulduğu
torpaq üstündə.
Bəşər addımıyla
yol alıb gedir,
Tarix də, zaman da
torpaq üstündə.
Vətən insanlığın
ilk taleyidir
Asiman altında,
torpaq üstündə.

*1988*

## BU GECƏ...

Möcüzə baş verib yer kürəsində,
Mənim xəyal adlı məmləkətim var.
Müqəddəs ruhların əhatəsində,
Bu gecə müqəddəs həmsöhbətim var.

İlahi səs gəlir qədim Gəncədən,
Nizami görünür – əsa əlində.
O, ulu babamız incikdir deyən,
Tapmadıq şerini ana dilində.

Nəsimi yanaşır... o, müdrik, nədim!
Səsində qürur var, vardır qəzəb də.
Deyəsən edama bir an gecikdim,
Məni asaydılar gərək Hələbdə.

Xətai şöhrəti gəzir dünyada –
Türkün türkə qılınc çalması, heyhat!
Şair güşənişin əgər olsa da,
Şahın güşənişin olması, heyhat!
O, deyir: Adımız ərşə bəllidir,
Ana dilimiz də nur təməllidir.

Füzuli – o, məğrur söz günəşindən,
Çəmənlər qızarır laləəriylə.
Odlu köynək geyib eşq atəşindən
Ney tək ürək yaxır nalələrilə:
– Nə qədər söz ara, nə qədər söz göz,
Əsil sənətkarı dövran istəməz!

Sevimli Vurğunun ruhuyla birgə,
Vaqif ağ yollara salır ağ kölgə.
Qayadan atırlar,
            Qartala dönür,
Bizim qəlbimizə uçub o qonur,
Pıçıldayır: Doğru halət görmədim,
Əyri gördüm, özgə babət görmədim!

Sabir qəzəblidir... o ulu insan!
Qana susadıqca əli – qanlılar,
Onun harayından titrəyir cahan:
– Vallah, müsəlmanam, a şirvanlılar!
...Mən göydə tuturam tənə daşını,
Gərək ki, nadanın əzim başını!

Xızı vadisilə duman sürünür,
Bir də görüşərik, Allah kərimdir!
Dağdan dağ vüqarlı bir cavan enir –
Bu gün o, yüz yaşlım, o Cəfərimdir!
Deyir: –Yara dəydi vətən köksünə,
Atan kazaklardır, bilirəm yenə!

Sibir şaxtasından,
            Qurtulmaq üçün,
Cavid mərd oğullar çiynində gəlir.
Böyük qardaşıyla görüşə bu gün,
Müşfiq gəmi ilə Nargindən gəlir.
– Oğlum, nə vaxtdı ki, səni gəzirdim.
– Ustadım, xoşbaxtam, mən səni gördüm!

Müqəddəs məclisə qonaq düşərkən,
Hətta yaddan çıxdı, öz adım, Allah!
Doğma dahilərlə mən görüşərkən,
İlahi bir gecə yaşadım, Allah!

...Tanrım, bu yuxuydu, ya həqiqətdi?
Elə düşündüm ki, sonsuz harayam!
Birdən üşütmələr gəzdi canımda,
Gecəylə gələnlər, gecəylə getdi.
Mənim yellər əsən xanımanımda,
Dəhşətlə duydum ki, yenə tənhayam...

Günəşin pərişan nuru saçıldı...
Ayrılıq səhəri, niyə açıldın?

*23 yanvar 2000*

## DÜNƏN

(*Nəğmə*)

Dünən necə görüşdü?
Ürəyə çınqı düşdü.
O mehriban gülüşdü,
Yoxsa ilahi paydı?
Dünən – bu gün olaydı!

İsindim nur selindən,
Öpdüm zərif telindən.
Tutdum günəş əlindən,
Bu günəş, yoxsa aydı?
Dünən – bu gün olaydı!

Nə gündüz, nə gecəydi,
Göylər yerlərə dəydi.
Bu necə möcüzəydi?
Evim nurlu saraydı,
Dünən – bu gün olaydı!

Qəlbdən nəğmə yüksəlsin,
Ah-amanlar kəsilsin.
Elə bir sabah gəlsin.
Deyim dünənə taydır.
Dünən – sabah olaydı!

*16 aprel 1990*

## ZƏRİFLİK

Lalələr parlayan
Çəməndə, düzdə,
Sanki büllur axan sudur zəriflik.
Hər gün kobudlaşan zəmanəmizdə,
Elə bil ilahi nurdur zəriflik.

Açılır ürəkdən
Ürəyə izlər,
Göydən Günəş çıxır, ümmandansa dürr.
Zəriflik sükutla danışan gözlər,
Bir də o gözlərin təbəssümüdür.

Sən gəl mehribanlıq
Önündə əyil,
Kimə qismət olsa, səadətdir o.
Zəriflik dünyada zəiflik deyil,
Bəlkə də ən ulu bir qüdrətdir o.

Kobudlar yanından
Tufan kimi keç,
Zərif insan gördün başına and iç!

Axı həyat sənə
Demir, sev kimi,
Verir təzə-təzə nəsil məhəbbət.
Qışqıran sevgilər məyər sevgimi?
Səssiz baxışlardır əsil məhəbbət.

Məhəbbət – bəşərin,
zərrin tacıdır,
Zəriflik, nəciblik qoşa bacıdır.
Cavandır, nə qədər
Qocalsa dünya,
Səadət – əzəli, əbədi olsun.
Zəriflik üstündə ucalsa dünya,
Qoy dünya nəciblik məbədi olsun!

*4 may 1997*

## ULU TANRIM, ŞÜKÜR SƏNƏ!

Addımbaşı tikanları bitirdin ki,
Zər saçaqlı tər güllərə səcdə qılaq?
Cahilləri sən dünyaya gətirdin ki,
Az tapılan aqillərə səcdə qılaq?
Ulu Tanrım, şükür sənə!

Ürəklərə qızıl körpü sən atdın ki,
O körpüdən qəhrəmanlıq keçsin gərək!
Namərdləri bu qədər çox yaratdın ki,
Mərdlər azsa, qədrini biz yaxşı bilək?
Ulu Tanrım, şükür sənə!

Sən əzəldən könüllərə nur qatdın ki,
Torpaqlara qara çöksə zülmət deyək?
Küt baltalı cəlladları çoxaltdın ki,
Pambıqla baş kəsənlərə rəhmət deyək?
Ulu Tanrım, şükür sənə!

Ucalardan sən uca bir xəbərdin ki,
Dedin: inam halalca duz-çörəkdədir.
Bizə qeyrət dəllalları göstərdin ki,
Bilək qeyrət dildə deyil, ürəkdədir?
Ulu Tanrım, şükür sənə!

Sən göyləri xıncım-xıncım sındırdın ki,
Başımıza od yağsa da addımlayaq?
Ümidsizlik günəşini yandırdın ki,
Ümid şəmi parlayanda günəş sayaq?
Ulu Tanrım, şükür sənə!
Şükür sənə,
Dönə-dönə!

*3 mart 1996*

## TOXUM SƏPƏK ÜRƏKLƏRƏ

Dərdi verək küləklərə,
Ağlamayaq için-için.
Toxum səpək ürəklərə,
Xeyirxahlıq göyərməkçin.

Nur ol, ötsün zil-qaranlıq,
İnam varsa, söz qətidir.
Yaxşılıqla mehribanlıq –
Məhəbbətin qüdrətidir.

Bulaq kimi sısqa axma,
Mərdlik coşan gur dənizdir.
Yaxşılığa əvəz umdun,
Yaxşılığı yerə vurdun.

Namərdlərə mərd söyləsən,
O ilan tək çalar səni.
Sən minnətli çörək yesən,
Boğazında qalar sənin.

Dad yox, yadlar çörəyində,
Haram üstə əsən qışam!
Əlim Allah ətəyində,
Kimsəyə əl açmamışam!

Halallıq var, mən də varam,
Nolsun oxum dəyir daşa!
Torpaqda da uyuyaram,
Pak vicdanla mən baş-başa!

*18-19 fevral 1996*

## NƏVƏM VÜSALIN BAĞ DÜŞÜNCƏLƏRİ

Yaz tətili gəlincə,
Baharı da, yayı da.
Mən yatıram hər gecə,
Sehirli çarpayıda.
Yuman kimi gözümü
Möcüzəli dünyada.
Mən görürəm özümü,
Şəfəqlərlə qol-qola
Çıxıram uzaq yola,
Buludu yara-yara
Asimana uçuram.
Uçuram ulduzlara,
Kəhkəşana uçuram.
Göylərə çatdıqca mən,
Ruhuma qanad gəlir.
Görürəm ki, üfüqdən
Atəş yallı at gəlir.

Nurladır göyü, yeri,
Zər tellər alov kimi,
O parlayan telləri
Tuturam cilov kimi.
Səma! Mənə yol eylə,
Bu gün yollar mənimdir!
Kəhkəşan üzəriylə,
At çapıram mən indi!
At uçur uzaqlara,
Ulduz-ulduz dağlara.
Şəfəqlər saçaq-saçaq,
Min sirr söyləyir mənə,
Baş qoyuram astaca
Ayın bəyaz köksünə.

Dan sökür aram-aram,
Mən birdən oyanıram.
Ulduzlarda yatıram,
Yerdəsə oyanıram.

*1994-1995*

## ÜRƏK – AĞIL

*Zaman qəlbə kəmənd atır,*
*Yara sızlar kürəyimdə.*
*Sənin gücün ağlındadır,*
*Mənim gücüm ürəyimdə.*
***N.Xəzri***

Gör necə qovuşur il-ilə, Allah,
Ağıl düşünərək, ürək sevərək.
İnsan varlığını
var elə Allah,
Ürəyə ağıl ver, ağıla ürək!

Təkcə ağıl sevsə –
bəladı sevgi,
Təkcə ürək sevsə –
atəşdir, oddur!
Ürəklə ağılın övladı sevgi,
İnsana uçmaqçın məğrur qanaddır.

Sevənlər! Ucalın
göylərə siz də,
Ucalın arzuya,
ümidə bağlı.
Sevənlər! Qovuşsun taleyinizdə
Ağlın ürəyilə,
ürəyin ağlı!

*27-28 may 1996*

## NƏYİM VARSA – MƏNİMLƏDİR

Hicran məndə, görüş məndə,
Kədər dolu gülüş məndə.
Tanrı sərvət bölüşəndə,
Mənə düşən dərdim-qəmim,
mənimlədir!

Dünya uca, dərdi dərin,
Qardaşıyam dərdlilərin.
Övladıyam göyün-yerin.
Nisgili sonsuz aləmim,
mənimlədir!

Yelkən açdım ümmanlarda,
Üzdüm coşan tufanlarda.
Lövbər atdım limanlarda,
Sınıb gələn arzu gəmim,
mənimlədir!

Mən qatdıqca ili-ilə,
Nəyim vardı, getdi yelə.
Şükürlər ki, mənim hələ,
Bir ürəyim, bir qələmim,
mənimlədir!

*28 sentyabr 1990*

## BARIŞ TALEYİNLƏ!

Axşam... çiçəklidir
Göylər çəməni,
Enir ayağına parlaq ulduzlar.
Neçin ağır gündə axtarmır səni,
Evinin dirəyi bildiyin dostlar?
Barış taleyinlə, barış, ay Nəbi!

Bağda necə vaxtsız
Tökdü xəzəllər,
Meyvələr nə erkən sovuldu, getdi.
Sənə "qartalımsan" deyən gözəllər
Uçub sərçələr tək yox oldu, getdi.
Barış taleyinlə, barış, ay Nəbi!

Üz gülmür,
Açılmır,
Qəlbdə şaxta, don,
Xəzri otağında oynayır külək.
Dünən gur zənglərdən sınan telefon
Bu gün boyun büküb susur yetim tək!
Barış taleyinlə, barış, ay Nəbi!

Sənə irişərdi
İşi düşənlər,
Təriflər qopardı sən dinən zaman.
İndi onlar səni görməyir məyər?
Niyə təşəxxüslə keçir yanından?
Barış taleyinlə, barış, ay Nəbi!
Axı nə baş verib
Görən cahanda,
Necə qapalıdır sehirlər, sirlər.
Məlum həqiqət var: gəmi batanda
İlkin siçovullar qaçıb gedirlər.
Barış taleyinlə, barış, ay Nəbi!

Zənginlər gördünmü, sən geri çəkil,
Varın-dövlətin də öz hökmü vardır,
Ürəyin doludur – bu meyar deyil,
Ciblərin boşdursa – bax bu meyardır!
Barış taleyinlə, barış, ay Nəbi!

Bəlkə qürurundur –
                    Günahkar bu gün?
Qürur haçan olub, haçan günahkar?
Fəqət dərin-dərin sən bir də düşün,
İnsan günahkardır, zaman günahkar?
Barış taleyinlə, barış, ay Nəbi!

Sinəni dərdlərə
                    Mərdanə gər sən,
Sevgi də, nifrət də müqəddəs olar.
Axı barışmasan
                    Sən neyləyərsən?
Sözlər də səhrada batan səs olar.
Barış taleyinlə, barış, ay Nəbi!

*20 iyul 1996*

## ANA, BAYRAQ, VƏTƏN

Qardaşım, dostları düşməndən ayır,
Ümiddən inama təməl qoyulur.
Dünyada Vətənsiz
                    insan olmayır,
Yalnız qeyrətsizlər Vətənsiz olur.

Vətən! Ömrümüzdən o ayrı deyil!
Arxa ol, xoş gündə, bəlalı gündə!
Sən yalnız dünyada
Səcdəyə əyil,
Bayraq qarşısında, ana önündə.

Vətən məhəbbəti
Göylərlə təndir,
Bayraq da, ana da
Çünki Vətəndir.
Sərin meşələrdən biz keçiriksə
Nahaq saf bulaqdan içmirik ki, biz.
Əyər ki, bayrağı
Biz seçiriksə,
Anayla Vətəni seçmirik ki, biz.

Qəzəb qılıncını çıxaraq qından,
İnsanda bu qədər dözüm olarmı?
Vətən can çəkirsə,
                    tapdaq altında
Bizim yaşamağa haqqımız varmı?

Üz tutur xaricə zəka axını,
O yerdə var-dövlət taparam, – deyə.
Unudub Vətənin
Ağır çağını
Kaş yollar getməsin vətənsizliyə.

İnsan – Vətənsiz,
Başdır – bədənsiz.
Biz nələr görmədik tanrı, amandır,
Vətənə yadlaşan insanlar oldu.
Vətən nə alınan
                    nə satılandır,
Hərraca qoyulan vicdanlar oldu.

Sabaha inanır qəhrəman insan,
O, millət dərdini daşıyacaqdır.
Vətənçin ölməyi
                    bacaran insan
Vətən ömrü qədər yaşayacaqdır!

*1-2 fevral 1997*

## DANIŞAN ƏLLƏR

*Gəl, – demək istəyir, gəl, – deyə bilmir,*
*Əllər dediyini dil deyə bilmir.*
***N.Xəzri***

O, sirli sözlər ki,
gəlməyir dilə
Elə bil söyləyir bu axşam əllər.
Öz doğma istisi, hərarətilə
Dillənən barmaqlar,
Danışan əllər.

Gözlərdən süzülür
Bir elə nur ki,
Dinir od ürəkdən alışan əllər.
Bəzən elə susur,
Elə susur ki,
Kobud bir ovuca sıxışan əllər.

Titrəyir şam kimi
İşıq saçdıqca,
Gözəlin özünə yaraşan əllər,
Pərişan telləri sığalladıqca
Özü də kədərli,
Pərişan əllər.
Qu tək yumşaqmıdır,
Süd tək ağmıdır?
Küsüşən barmaqlar, barışan əllər.
Mənə öz sirrini açaçaqmıdır
Danışan barmaqlar,
Danışan əllər?

*5 yanvar 1998*

## SƏNƏ

Aşdı bir zirvəni
Təzə il bu gün,
Dağlar da insanla
Ucalır göyə.
Dağ sənə söykənir
Elə bil bu gün
Mənsə dağ gəzirəm
Söykənim – deyə!

Ürək nələr umar
Nurlu səhərdən?
Sən Aysan,
Mən isə
Solğun haləyəm.
Gur çaysan,
Axırsan
Göy dərələrdən,
Mən isə quruyan
Bir şəlaləyəm!

Sənsən dan yerində
Parlayan atəş,
Mən isə, qüruba
Əyilən günəş!

Dözərəm, üstümə
Göylər ensə də,
Döndüm ovu itmiş
Səyyada, əfsus!
Sənə qəlbim mənim
Tez isinsə də
Əfsus, gec görüşdük
Dunyada, əfsus!
Bəlkə nişanəsən
Son məhəbbətdən,
Bəlkə də müjdəsən
Əbədiyyətdən!?

*1 yanvar 1998*

## TARİXİN DƏRSLƏRİNDƏN

Yalnız silahdamı dünyada qüvvət?
Ədalət səbrlə atır addımı.
Süngülər üstündə dayanan dövlət –
Elə süngülərlə yıxılmadımı?

Xəyanət deyilmi ən çirkin əməl?
El çəkir lənətlə satqın adını.
Təriflər üstündə yüksələn heykəl –
Elə təriflərlə uçulmadımı?

Həqiqi sədaqət tutulmaz ucuz,
Sevgi də intiqam alar mərd kimi.
Alqışlar üstündə ucalan nüfuz –
Sonra qarğışlara çevrilmədimi?

Duydu hökmdarlar sənəti məyər?
Nə oldu ilk andı, son etimadı?
Dövlət də, millət də mənəm – deyənlər.
Xalqın mənliyini necə tapdadı?

Biz başa vururuq böyük bir əsri,
Tale sehirli bir gələcəkmidir?
Tarix dünən verdi bizə bu dərsi
Sabah da bu dərsi verəcəkmidir?

*16–17 iyun 1996*

## KİMDİR?

– İnsanın yaxşısı, ya pisi kimdir?
– Sadəliklə olur ilahi insan!
– Dünyanın ən böyük dahisi kimdir?
– Ən adi insandır – ən dahi insan!

– Söylə, yer üzünün vüqarı kimdir?
– İnsana sitayiş kimdə varsa, o!
– Dünyanın ən böyük şairi kimdir?
– Yazmaq yox, pozmağı kim bacarsa, o!

– Həyatda əbədi əzəli kimdir?
– Kim hörmət qazanır özü özünə.
– Dünyanın ən böyük aqili kimdir?
– Kim cavab vermirsə cahil sözünə!

– Rütbənin, şöhrətin ilk qulu kimdir?
– Kim ki, vəzifəyə daim baş əyir!
– Dünyanın ən böyük yoxsulu kimdir?
– Kim ki, milyon üstdə əsib titrəyir!

– Mən yuxu görmüşəm, yozan bəs kimdir?
– O deyir: Bir ömrün bitməyib yolu!
– O zaman bu şeri yazan bəs kimdir?
– Böyük bir Vətənin kiçik bir oğlu!

*19-20 may 1996*

## ŞƏKLİNƏ BAXIRAM

*Mərhum ömür yoldaşım **Gülarə** üçün*

Sən getdin cahanın
Dərdli çağında.
Bir çaya döndüm ki, sısqa axıram.
...Sənsiz bir otağın tənhalığında
Şəklinə baxıram...
Yenə baxıram.

Əsir pəncərədən
Yel incə-incə,
Sanki isti nəfəs üzümə dəyir.
– Gecən xeyrə qalsın – söylərəm gecə,
Səhər də söylərəm: sabahın xeyir!

Ürəyim narahat,
Qulağım səsdə
Dövrün haqsızlığı titrədir məni.
Çevrilib mələyə başımın üstdə,
Ruhun gecə-gündüz hifz edir məni.

Axı, səninlədir hər anım mənim,
Sən mənim nisgilim, pərişanımsan.
Gündüz şəkillərdə susanım mənim,
Gecə yuxularda danışanımsan;
– Ay Nəbi, özündən muğayat ol sən,
Bil, daha dünənki cavan deyilsən.
– Əlbəttə, mən səni itirən gündən,
Həyatım dəyişdi tamam kökündən.

Qar əskik olmayır doğma dağımdan
Bir gündə asılıb hər ayağımdan.
Bəzən yersiz düşdük haya, haraya,
Axı pis də gedir, yaxşı da qalmır.
Sən məni qısqandın bütün dünyaya,

İndi dünya məni heç saya salmır.
Tanrım bağışlasın,
Günah varsa da,
Günah xoşbəxtlikdən pay alan deyil.
– Gənclik günahları yuyularsa da,
Qocalıq günahı yuyulan deyil!

Gec duydum həyatın
Mən sirlərini,
Zaman pərişandır, ömür pərişan.
Mən öz günahımın zəncirlərini
Çoxdan parçalayıb, çoxdan qırmışam.

Səni yana-yana səsləyirəm ki,
Eşitsin sözümü sevdiyim mələk.
Dünyada o günü gözləyirəm ki,
Gülarə adında nəvəm gələcək.

Şəklinə baxıram,
Baxıram yenə,
Sanıram çiynimə yumşaq əl dəyir.
– Gecən xeyrə qalsın – deyirəm sənə
Səhər deyəcəyəm:
– Sabahın xeyir!

*8 aprel 1995*

## YETİMLİK

Zaman ümmanında
Bir ömür üzdük,
Məgər poladdandır əsəblərimiz?
Atanı, ananı itirdik, dözdük,
Torpağı itirdik necə dözək biz?

Yadlar əkib-biçən torpaq yetimdir
Elatı gəlməyən yaylaq yetimdir.

Baxırıq sabaha yenə ümidlə,
İntiqam adlanan zaman gələcək.
Gələcək torpağın sahibi mütləq,
Dağlar haray çəkir haçan gələcək?

Bulanıq axdıqca gur sellər, sular,
Uçar o kimsəsiz ev ki, yetimdir.
Yetimdir bəlalı hisslər, duyğular,
Qədri bilinmyən sevgi yetimdir.

İnamsız yer ilə göy dağılardı,
Dəniz də coşmazdı çay olmasaydı.
Günəş də göylərdə yetim qalardı,
Əgər ulduzlarla Ay olmasaydı.

Yerdə əl çatmayan, haray yetməyən,
Gülünü qış vurmuş bahar yetimdir.
Kimsə hüzuruna gəlib getməyən,
Dövrəsi ot basmış məzar yetimdir.

Çiçəklər sazaqdan elə solur ki,
Deyirsən dünyanın yetişib sonu.
Şair də o zaman yetim olur ki,
Nə zaman ilhamı tərk edir onu.

Qoy axsın qanıma dəniz də, çay da,
Qoy ilham qapıma gəlməsin qonaq.
Əgər yetim qalsa Günəş də, Ay da,
Təki biz torpaqsız yetim qalmayaq.

*17 aprel 1997*

## SÖYLƏ, BƏS HARDAYDIN?..

Sən gəldin,
Zülmətdən gün çıxdı birdən,
Nə qədər ecazkar göründü cahan?
Səni gözləmişdim ömrüm boyu mən,
Söylə, bəs hardaydın sən bu vaxtacan?

Keçib göy dərəni,
                    yaşıl çəməni,
Elə yaxın gəldin, elə uzaqdan!
Bəlkə min il əvvəl görmüşdüm səni,
Sərin su içəndə sən buz bulaqdan!

Elə bil üzləşdim
                    ilahi sirlə,
Bu nə möcüzədir, bu nə heyrətdir?!
Məhəbbət ölçülmür illə, əsrlə,
Məhəbbət ölçüsü əbədiyyətdir.

Zöhrə ulduzu tək
                    yanıb obaşdan,
Üfüqlər aşırdın xəyallarımda.
Sən hələ dünyaya göz açmamışdan,
Küsüb-barışırdın xəyallarımda.

Sən gəldin ömrümün
                    qarlı qışında,
Ruhumda ehtiras, ürəyimdə qəm.
Cənnət qapısının elçi daşında,
Hazırdım min il də səni gözləyəm.

O nəydi?
Zülmətdən gün çıxdı birdən,
Nə qədər ecazkar göründü cahan!
Səni axtarırdım ömrüm boyu mən,
Söylə bəs hardaydın sən bu vaxtacan?

*1998*

## DƏNİZ, GÖY, MƏHƏBBƏT

### I

– Dənizi hədiyyə verirəm sənə...
Mən dedim, sən baxdın, sən gülümsədin.
Göylərin şəfəqi düşdü üzünə.
– Mən isə... göyləri verirəm, – dedin...

Ayrıldıq qəribə hədiyyələrlə,
Göylər eşqim kimi mənə əzizdir.
Ayrıldıq dənizlə, ağ ləpələrlə,
Necə aparasan? Dəniz dənizdir.

Dənizi verdim ki, sənə hədiyyə,
Gəldiyim sahilə gələsən bir də.
Məni görməyəndə o mənəm – deyə,
Mənimlə danışıb, güləsən bir də.

– Əgər görüşməsək, bizə dağ olar,
Dedim, neçə dəfə belə dedim mən.
Dəniz sahilinə qayıtmaq olar,
Göylərin sahili varmı, gedim mən?!

Düşündüm, ayrılıq gələndən bəri,
Sən mənim eşqimə çıraq olasan.
Onunçün verdinmi mənə göyləri,
Məndən göylər qədər uzaq olasan?!

### II

Mən bir dənizəm ki, eşqim səhərdir,
Səni düşünürəm, əzizim, yenə.
Mənim dalğalarım xatirələrdir,
Qoy çatsın qəlbinin
                        sahillərinə.

Əsl məhəbbət ki, böyük hünərdir,
Coşar ümman kimi təzə arzular.
Mənim dalğalarım
                    xatirələrdir,
Orda tufan da var, burulğan da var.
Dənizəm, eşqimdən qaçmaq hədərdir,
Mən ki, adlayıram çölü, çəməni.
Mənim dalğalarım,
                    xatirələrdir,
Gecə də, gündüz də tapacaq səni.

**III**

İstəsən yuxuna gələrəm sənin,
          gələrəm dəniz kimi.
Üzünə incilər çilərəm sənin,
          çilərəm dəniz kimi.
Yoluna şəfəqlər səpərəm hərdən,
          səpərəm dəniz kimi.
İstəsən üzündən öpərəm hərdən,
          öpərəm dəniz kimi.
Adını qəlbimin sahillərinə,
          yazaram dəniz kimi,
"Sevirəm" söyləsən bir axşam mənə,
          Susaram dəniz kimi,
                    Susaram dəniz kimi.

**IV**

Dünyada sakitlik aramadım mən,
Günəş kimi parla,
          səhər kimi gəl.
Göylərtək yuxuma gəlmək istəsən,
Sən aylı, ulduzlu göylər kimi gəl.

Adla qucağından gur tufanların,
Mən baxım axşamdan səhərə kimi.

Adla ağ yoluyla kəhkəşanların,
Parlasın hər ulduz xatirə kimi.

Gəl, qış gecəsində,
            yaz səhərində,
Dənizi göylərdən ayırmaq olmaz!
Sonsuz kainatın üfüqlərində,
Sən görüş vaxtını şimşəklərlə yaz!

Mən gərək nəğmətək səni dinləyəm,
Sən mənim eşqimlə, ürəyimləsən.

Nə qədər göylər var, mən səninləyəm,
Nə qədər dəniz var, sən mənimləsən.

*1963*

## AT, ÖVLAD VƏ TORPAQ

(*Xalq rəvayəti*)

*Bu rəvayəti mənə danışmış müdrik alim*
*dostum Mirəli Seyidova minnətdaram*

Xəyal uzaq-uzaq
İllərə vardı,
Çaparlar yollarda
Duman qopardı.
Çatdı hökmdardan
Xaqana xəbər:
– Gözəl ağ atını
sən mənə göndər!
"Ağ atı verəkmi?
At ki, qanaddır".
Gəldi məsləhətə
El dəstə-dəstə.
Xaqan çox düşündü,
O, qəmə batdı.
Dedi: qan düşməsin
Bir atın üstdə.
İl keçdi...
Buludlar
Dağları sardı,
Çaparlar yollarda
Duman qopardı.
Çatdı hökmdardan
Xaqana xəbər:
– Ortancıl oğlunu
sən mənə göndər!
Mənim qoşunumda
Əsgərlik etsin,
Yox, yox ağ atıma
Mehtərlik etsin.
"Övladdan əl çəkək?
Övlad muraddır!"

Gəldi məsləhətə
El dəstə-dəstə.
Xaqan çox düşündü,
O, qəmə batdı.
Dedi: qan düşməsin
Bir oğul üstdə!
Dünyaya nur saçan
Erkən bahardı,
Çaparlar yollarda
Duman qopardı:
– Daha darlıq edir
burda yer mənə.
Qonşu torpaqları
Xaqan, ver mənə!
"Yadlar hakim olsun
yurdunda sənin?"
Gəldi məsləhətə
El dəstə-dəstə.
– Vecsiz torpaqlardır
qoy verək getsin,
Kol-kos da bitməyir
o şoran düzdə.
Vaxt keçdi, –
Sükutlu dəqiqələrlə
Xaqan öz yerindən
Qalxdı kədərlə:
– Ağ atı verdim ki,
mən at taparam,
Övladı verdim ki,
Övlad taparam.
Mən torpaq tapmaram,
Fəqət dünyada,
Niyə torpağımı
Mən verdim yada?
Torpaq mənim deyil –
Xalqındır torpaq,
Ancaq ədalətin,

Haqqındır torpaq.
Babamdan bu torpaq
Mənə mirasdır,
Bu torpaq üstündə
Ölsəm də azdır.
Gəl, düşmən,
yasını görəcək aləm,
Sənə özün boyda
torpaq verərəm!
Çaparlar hövlnək geri çapdılar.
...Yadlar bu torpaqda
qəbir tapdılar.

*1988*

## DÜNYA NECƏ DÜNYADIR?

Kimdə arzu sonsuzdur,
Kimdə arzu ilğımı.
Kimə bahar əbədi,
Kiməsə qış iqlimi.
Kimdə ümid atəşi,
Kimdə ümid zərrəsi,
Kimdə inam günəşi,
Kimdə inam şöləsi.
Kimisi şərbət içir,
Kimisi zəhər udur.
Kimə milyon da azdır,
Kiməsə min də çoxdur.
Kim nəfsinin nökəri –
Kasıbların ağası,
Kimin yası dünəndi,
Kimin bu gündür yası.
Kimsə altun sarayda,
Kimsə uçuq daxmada.
Kimin gözü doymayır,
Kimə bəsdir loxma da.
Kimdə tülkü hiyləsi,
Kimdə aslan qüvvəsi,
Tülküyə rütbə düşür,
Aslana qurd qəfəsi.
Kimdə ədalət sözü,
Kimdə ədalət özü.
Dünya necə dünyadır?
Kimə günəşli gündüz,
Kimə gecə dünyadır!
Mən bilmirəm niyə sən
Söylə, beləsən dünya?
Mənimlə öz sirrini
Bəlkə, böləsən, dünya?
...Bu an dünya sükutu –
Heç də sükut deyildi!
Sandım min-min sirr mənə,
Pıçıltıyla deyildi!

*1 yanvar 2000*

## ƏN BÖYÜK FACİƏ NƏ ZAMAN OLUR?

Xəsis – səxavətdən,
Qəddar – ədalətdən,
Yaltaq – məharətdən
Danışan zaman

Vicdansız – vicdandan,
İmansız – imandan,
Amansız – amandan
Danışan zaman

Əxlaqsız – əxlaqdan,
Haqqı danan – haqdan,
Xalqı satan – xalqdan
Danışan zaman

Yalan – həqiqətdən,
Xain – sədaqətdən,
Qorxaq – cəsarətdən
Danışan zaman,
Faciə içində sarsılar cahan!

*13 yanvar 2000*

## İLLƏR KARVANIM

Gedir aram-aram
öz qatarıyla,
Gah susur, gah dinir
gah uçur illər.
Hardasa zınqrov
sədalarıyla,
Cahan karvanına
Qovuşur illər.
Gedir ləngər ilə
O asta-asta,
Ardınca nə qədər
nanəcib gedir.
Yanır göy qurşağı
Karvanın üstdə,
Zərrin tac altından
O keçib gedir.
Gedir, hardan, haçan,
Yollara çıxıb,
Mavi üfüqlərə
mehriban olur.
Yerdə dərin-dərin
açılan cığır,
– Göylər sinəsində
Kəhkəşan olur.
Gedir, doğulduğum
O, uzaq gündən,
Yolda çinar durur
cərgələnərək.
İstidə karvanın
Əsir üstündən,
Xəzərin ətrini
gətirən külək.
Gedir, öz yolundan
Dönən deyil o,

Üfüqdə nur yanır
            Nur sönür bəzən.
Onun qarşısında
            Qum təpəsi yox,
Dəmir barmaqlıqlar
            Görünür bəzən.
Gedir, tufan qopub
            yellər əssə də,
Durmayıb dünyada
            gedəcək yenə.
Karvan sarbanını
            itirərsə də,
O məndən sonra da
            gedəcək yenə!

*2 yanvar 2000*

## MEYDAN

Çiçəklər şaxtasız
                  elə solub ki,
Qışın dəhşətini torpaq da duyur.
...Meydan sulayanlar peyda olub ki,
Bu gün yerə, göyə meydan oxuyur.

Hardadır cıdırda
                  zəfər çalanlar,
"Tayota", "Mersedes" sevilir burda.
At çapıb meydanda nəmər alanlar,
Qarabağ atını heç tanımır da.

Həqiqət, ədalət
                  əzizdir, əziz,
Gah isti, gah soyuq küləklər əsir.
"Azadlıq" meydanı azad, kimsəsiz,
"Qələbə" meydanı qələbə gəzir.

Varlı heç kimsəni
                  salmayır saya,
O, öz dövlətilə fəqan eyləyir.
Məddah da yabını çəkib ortaya:
– Mən də bu meydanda varam, – söyləyir.

Yellər haram pulu
                  göyə sovursun,
Meydan oxuyanın burnu ovular.
Məddahı yabısı qoy özü vursun,
Meydan sulayanı batırsın sular!

*23-24 dekabr 2000*

## MƏHKUM

Bəlkə vaxtsız əsən
Səmumdur insan.
Səhrada sovrulan tufana məhkum.
Onsuz da ölümə məhkumdur insan,
Ölümdən də betər hicrana məhkum!

Yolları ayrıdır
Xeyrin, şərin də,
Susan həqiqətlər yalana məhkum.
O qədər mələk var yer üzərində,
Dedim ki, olmaram şeytana məhkum!

Ürəkdən ürəyə
Körpü atıram,
Özümsə uçruma, yarğana məhkum!
Mən ki, dərdlər alıb, qəmlər satıram,
Belə alış-veriş ziyana məhkum!

Yer üzü titrəyər,
Göy üzü ağlar,
Dünya faciəli zamana məhkum.
Çiynində günəşi gətirən dağlar,
Görürsən bir qatı dumana məhkum!

Bəşərin dərdini
Hər an çəkən mən,
Yaşaram əlaca, dərmana məhkum.
Bir damla su üçün təşnə ikən mən,
Olmuşam bir duzlu ümmana məhkum!
Mən ki, heç bilmədim
Niyə doğuldum?
Əsrə məhkum gəldim, cahana məhkum.
Özümü bir sarban
Saysam da,
Oldum
Mənzilə çatmayan karvana məhkum!

*10 noyabr 1996*

# ALTIAĞACDA

*Dünya şöhrətli alim dostum,*
*professor* ***Rafiq Yusifliyə***

Silinsin ürəkdən
                    Həsrətin qəmi,
Müqəddəs yer deyə,
                    göy deyə gəldik.
Dağlar ən ilahi
                    ehramlar kimi,
Dostumla dağları
                    səcdəyə gəldik.

Başımız üstündə zərli qanadlar,
Kəhrəba çinarlar, qızıl palıdlar.

Belə yer dünyada deyin varmıdır,
Meşə pıçıldayır, bulaq danışır?
Günəşdən süzülən ulduzlarmıdır,
Ya kəhraba yanır, qızıl sayrışır?

Sirli bir qələmlə söz yaza-yaza,
Ağaclar zər səpir yollarımıza.

Mən burda payızın oğlan çağında,
Meşələr qoynunda necə zənginəm.
Haçan axşam düşür –
                    Ay işığında,
Palıdlar boyanır polad rənginə.
Bu dağlar nə ulu
                    Bir əfsanədir,
Burda xəzan özü zər xəzinədir.

Qarşı zirvələrdə maral göründü,
Sonra birdən-birə xəyala döndü.

Ömrünü qoydumu güllə yarıda?
Şair burda dayan, şair burda dur!
Mehriban dağların ovçuları da
İnsafsız olmayır, mehriban olur.

Sehirli səslərlə doludur cahan,
Dinir büllur çayla, parlaq şəlalə.
Bir zirvə danışır Cəfər adından,
Bir zirvə danışır Müşfiq dililə.

Dönürük, bizimlə
qoşa gedirlər
Kəhrəba çətirlər,
qızıl çətirlər.
Gedir dağ amanı, ahı bizimlə,
Gedir dahilərin ruhu bizimlə.
Torpaq ətirlidir,
səma ətirli,
Nağıl dünyasına dəydik qayıtdıq.
Yerlər möcüzəli, göylər sehirli,
Cənnət qapısını
döydük qayıtdıq.

*Oktyabr–Noyabr 2000*

## MÜŞFİQ EVİ

*Payız vaxtı dağlar qoynunda **Müşfiq** evinə gedən körpünü sellərin uçurduğunu gördüm*

Əziz Müşfiqimi
Bu doğma dağdan,
Dünən qanlı-qanlı əllər ayırdı.
Bu gün bura gələn dostdan, qonaqdan,
Çağlayan dalğalar, sellər ayırdı.

Qumral saçlarını
Daradı külək,
Xoşbaxtlıq gəzərkən dərd çəkdi burda.
Qəbrin yox, qəbrinə səcdəyə gələk,
El sənə kiçicik ev tikdi burda.

İnamı məhəbbət,
Andı həqiqət,
Onun nə dəhşətli taleyi vardı.
Zəngin saraylara sığmayan şöhrət,
Bu kiçik komaya necə sığardı?

O, ilham dağında
Zirvəyə çatdı,
Vətən səcdə qıldı məğrur sözünə.
O, min-min ürəyə körpülər atdı,
Təbiət qəsd etdi son körpüsünə!

Ev də yetim qaldı,
Sahibi kimi,
Durdu yerin-göyün,
Qalibi kimi!

Burdadır məhəbbət,
Hörmət yolları,
Yenə görüşərik yaz səhərində.
Gələr dəstə-dəstə el oğulları,
Saxlayar körpünü çiyinlərində.

*Oktyabr 2000–Yanvar 2001*

## KİMİN İSTƏYİ NƏDİR?

Kim isə, nəyisə
Seçir dünyada;
Ağıl gözəlliyi,
Üz gözəlliyi!
Adam var şərbət tək
İçir dünyada,
Saxta səslənsə də
Söz gözəlliyi.

Mənim gözlədiyim
Gözəlliyim gəl,
Kim deyər çəməndən
Səhra gözəldir?
Mənimçin cahanda
Hər şeydən əvvəl,
Ürək gözəlliyi
Daha gözəldir!

Belə gözəlliyi
Görmək savabdır.
Hər insan bir cürə
Duyur aləmi.
Ürək gözəlliyi
Təmizdir, safdır.
Dəryalardan çıxan
Mirvari kimi.

*3 avqust 2000*

## TUFANLA SÖHBƏT

– Yer də, göy də əsir sən coşan kimi,
Bu qədər dünyada sərtlik ki, olmaz!
– Eşit ürəyimi, dinlə səsimi,
Tufanlar olmasa sakitlik olmaz.

– Çağlayıb coşduqca sən qaranlıqda,
Axı neçə görüm tufan qəlbini?
– Məndə qəzəb də var, mehribanlıq da,
Fəqət sındırmaram insan qəlbini.

– Elə bil qovuşur yerlə asiman,
Dənizdə dalğalar – hər biri dağdır.
– Dünya təzələnir mən əsən zaman,
Dərya çağlayırsa, durulacaqdır.

– Amandır, lalələr üstündən əsmə,
Kübar sülalələr üzərindən əs!
– Göylər də səs verir, mənim səsimə,
Tufandan payını alacaq hər kəs.

– Tufan, haqsızlığa sən etirazsan?
Bəs, neçin adınla yol almışam mən?
– Əgər tufan dolu bir şeir yazsan,
Deyərəm qəlbində yurd salmışam mən.

*9 yanvar 2000*

## KİRAYƏNİŞİN

Gözlənməz qonaq tək
Cahana gəldik,
Göydə ulduz yandı,
Səssiz – səmirsiz.
Dünyada bir guşə
Kirayələdik.
Dedik: – Nə gözəldir
Bizim evimiz.

Elə bil kədərlə,
Qəmlə yaşıdıq.
Kədərsiz sevinc *yox,*
Əziz saxlayaq.
Ağlayıb gəlmişdik,
Ağlar yaşadıq.
Macal olacaqmı
Sonda ağlayaq?

Atıldıq illərin
Qovğasına biz,
Pay umduq cahanın
Səxavətindən.
Sandıq ki, ömrümüz
Bahasına biz,
Çıxarıq dünyanın
Xəcalətindən.

Kim dedi: qapılar
Pulla açılar,
Kim dedi: dünyaya
Özüməm şərik!
Neçindir bu qədər
Ağrı-acılar?
Lüt gəldik, eləcə
Lüt də gedirik.

Dünya ümman oldu,
Bizsə tək ada.
Yenə işıq saçdı,
O, uzaq ulduz.
Kirayə tutmuşduq
Biz bu dünyada,
Xərcini ödəyə
Bilmədik, əfsus!

Həyatın nifrəti,
Məhəbbəti var.
İllər yolumuza
Güllər sərəcək.
Dünyanın nə böyük
Səxavəti var.
Bizə beş qarış da
Torpaq verəcək.

Axacaq ulduzum
Zər tökə-tökə,
Son gün son mənzilə
Enəcək bəlkə?

*8 yanvar 2000*

## FƏRSİZ

– Fərsizsən, düzünü
Deyirəm sənə.
Bax, qonşun daş əkib
Almas bitirir.
Göm-göy əskinaslar
Axır cibinə!
– Kim nəsə qazanır,
          nəsə itirir,
Ən böyük qorxu da
          Var-dövlət verir.

– Sənin günün keçir,
Qəmdə, təlaşda,
Onun gör necə də
Bəxti gətirir.
Başçıya baş əyən
Yuxarı başda...
– Kim nəsə qazanır,
          nəsə itirir,
Yaltaqlıq – mənəvi
          Əsarət verir.

– Fərsizin qırılar
Ömrü yarıda.
Ondan ibrət götür,
Gör nədir bu sir!
Yüksək rütbədədir
Övladları da...
– Kim nəsə qazanır,
          nəsə itirir.
Son hökmü əlbəttə
          Ədalət verir.

– Ədalət gəlincə
Can gedir əldən.

Kitab həsrətilə
Yan sətir-sətir.
O, əldən bərk tutur,
Sən isə eldən...
– Kim nəsə qazanır,
nəsə itirir.
Əsil qiyməti də,
El, millət verir!
Mənə qibtə etməz,
Dünyada heç kim,
Mənə ancaq mənim
Qürurum qaldı,
Bu gün mənimlədir
İtirdiklərim,
Fəqət qazandığım
Bu gün xəyaldır!

*7 oktyabr 1999*

## UZUN SÖZÜN QISASI

Gəldi riya,
Getdi həya!

Baxdı paxıl,
Yandı taxıl!

Güldü yaltaq,
Ağladı dağ!

Pıç-pıç çuğul,
Özünə qul!

Qanun güdən,
Yırtdı gödən!

Bəsdir, şair,
Haray nədir?

Sözlər ucuz,
Bəşər quduz!

Vədlər – bəla,
El mübtəla!

Dindi nadan,
Susdu cahan!

*12 mart 2000*

## ŞEİR MƏNİM ÜÇÜN BİR KAİNATDIR

Şeir mənim üçün bir kainatdır,
Onun ulduzları,
                Günəşləri var.
Şeir mənim üçün sirli həyatdır,
Onun öz sevinci,
                öz kədəri var.

Şeir də yaşayır öz baharıyla,
Ona yol da verir sonsuz asiman.
O keçir təbii addımlarıyla,
Süni peyklərin aşdığı yoldan.
Keçir addım-addım
                kənddən, şəhərdən,
Ulduzlar üstünün naxışı kimi.
O keçir başına yağsa da hərdən,
Tənqidlər meteor yağışı kimi.
Sözüm də gücünü
                ellərdən alıb,
Qoy uçsun göylərə,
                o, birnəfəsə.
Qalın qatlardakı yanan peyk olub,
Nə qəm,
                neçə şerim geri dönməsə.
Nə qədər qol-qanad,
                açsa da ilham,
Mən ana torpağın sinəsindəyəm.
Nə qədər göylərə uçsa da ilham,
Mən yerin cazibə qüvvəsindəyəm.
Yenə düşüncələr aparır məni,
Deyirəm: susmaram boran-qar olsun.
Gəzirəm sevdiyim ana Vətəni,
Misralar gəzirəm,
                misralar olsun.

Şerə vurulduğum, de, aymı, ilmi?
Qəlbim arzularda, diləklərdədir.
Ən böyük kainat sənət deyilmi,
Sənət kainatı ürəklərdədir.

Hər kəs xoşbəxt olar öz diyarında,
Əzizdir əzəldən öz yerim dedim.
Kaş xalq ürəyinin fəzalarında,
Dünyalar dolaşa bir şerim dedim.

Baxıram göylərə qəlbimdə şeir,
Ulduzlar uzaqdan göz vurur mənə.
Kainat sirrini açsa da bir-bir,
Sənət kainatı sirlidir yenə.

Bəli, şeir mənə bir kainatdır,
Sözlü, soraqlıdır
                    bir kitab kimi.
Bəli, şeir mənə sirli həyatdır,
Açsam da,
                    bağlıdır bir kitab kimi.

*1992*

## YALAN VƏ HƏQİQƏT

Sənə səcdə qıldım, sənə baş əydim,
Qəzəb sükutunu qəlbən eşitdim.
Günahkar olardım yalan desəydim,
Həqiqəti dedim,
                    cinayət etdim.

Mən neçə unudum nurlu gözləri?
Yəqin süni imiş o "can" sözləri.

Sən mənim ömrümdən şimşək olub keç,
Məndən uzaqda da mənimçin varsan.
Qapından dilənçi qovmamısan heç
Məhəbbət umanı necə qovursan?

Susuram... nə qada, nə də qan olsun,
Sevgiyə həqiqət qadağan olsun?

Sözümü ulduzlar göylərə yazsın,
Ölərkən mən eşqin ehtiyacından,
Yalan qüdrətlidir qoy məni assın,
Assın həqiqətin dar ağacından!

*17 may 2000*

## HƏSRƏT

Bir qız keçdi burdan,
Keçdi, dayandı.
"Şıltaqdır" – dedilər, "dəli ceyrandır".
Amma ki, hüsnünə hamı heyrandır.
Bu günsə sahillər o qıza həsrət.
Axşam gözlər yandı,
gur şəfəqlərdən,
"– O ulduz mənimdir" – dilləndi birdən:
"Marsa qanad açıb uçacağam mən"...
O, yoxdur, baxıram ulduza həsrət.

Mən Qütb ulduzunu
Göstərdim bu vaxt:
Tək o dəyişməyir yerini ancaq!
Ona bənzəmişəm mən də yanaraq,
Qışlar yaşamışam mən yaza həsrət.

Susmuş sözlərimi
açdım küləyə...
Solan ağaclara, ulduzlu göyə.
İndi tək baxaram – sənsizəm – deyə,
Çöküb qəlbim kimi payıza həsrət.

*Zuğulba, sentyabr 1998*

## QADINSIZ EV

Çiyinlərdə yerin-göyün qəmidir,
Ah çəkirsən asimana yetişir.
Qadınsız ev –
tufandakı gəmidir,
O nə batır, nə limana yetişir.

Ağır dərdlər faciənin gücüdür,
Nə sevinib, nə də gülə bilirsən.
Qadınsız ev –
xəstəxana küncüdür,
Nə dirilir, nə də ölə bilirsən.

Fəlakətdə neçə-neçə sirr yatır,
Səni yıxır, polad kimi o sınmır.
Qadınsız ev –
günəşsiz bir dünyadır,
Nə od yansa, qızınmır ki, qızınmır.

Sən bir quşsan, ruhun sınmış qanaddır,
Heç baxma ki, külək sərin, meh ılıq...
Qadınsız ev –
ulduzsuz kainatdır,
Həmdəmindir sükut ilə qaranlıq.

Ey kişilər!
Sevginizi əzizləyin cahanda,
Qadınlığın sədaqətdir ilk adı.
Vay o gündən –
ömrün axır anında,
Gözünüzü qapayan da olmadı!

*7-10 oktyabr 1996*

## GÜLMƏYƏN GÖZLƏR

Sirli bir dünyadır
Sanki hər ömür,
Baxışlar mehriban,
Söz səmimidir.
Onun özü gülür,
Gözləri gülmür.
Bəlkə göz sükutu –
Ürək qəmidir.

O, zərif əllərdən
Tutdum mən dünən,
Əl varmı, beləcə
Sehirli olsun?
O, üzdən bu qədər
Xoşbəxt görünən
Nə üçün bu qədər
Kədərli olsun?
Ensə üfüqlərdən
Ağ bir göyərçin,
Olar göy suların
Bəyaz dalqası.
Eyni bir taleyə
Yazılır neçin,
Kədər ümmanıyla
Sevinc damlası?

Ürək ovunmayır,
Şirin söz ilə.
O gözlərdə yanan
Kəhkəşan deyil?
Hamıya mehriban
Olan gözələ,
Nə üçün təbiət
Mehriban deyil?

Hərdən göz yaşını
Silən gözlərə,
Uzaq ulduzların
Nuru tökülsün!
Biz çox alışmışıq
Gülən gözlərə,
Gülməyən gözlərin
Qoy bəxti gülsün!

*10 may 1999*

## AD GÜNÜ – FƏRYAD GÜNÜ

*C.Naxçıvanski adına hərbi məktəbin 17 yaşlı tələbəsi Ruslan İsayev bacısının ad gününə tələsərkən, metroda baş vermiş yanğında (28 oktyabr 1995-ci il) 4 nəfəri ölümdən xilas etmiş, özü də qəhrəmancasına həlak olmuşdur.*

***Qəzetlərdən***

Dünya məhvərindən
Qopdu elə bil,
Oğlan görmədiyi dəhşəti gördü.
Qara əjdaha tək uzanan tunel
Sanki xortumundan od püskürürdü.

Yer əsdi atəşli,
Odlu səslərdən,
Alov hücum çəkdi insan ömrünə.
Onun tələsdiyi ad günü birdən,
Döndü faciəli fəryad gününə.

Alovun nə məşum dilləri varmış?
Dəmir də yanarmış, daş da yanarmış!

Elə bil yağırdı
Odlu yağışlar,
Odlu sel axırdı relslərin üstdən.
O birdən düşündü: "Bacım, bağışla,
Sənin ad gününə gecikirəm mən".
Özü də odlarda o yana-yana,
Yanan insanları aldı qoynuna.

Əlində ölümün
sındı qanadı,
Mərd çıxdı alovlar keşməkeşindən.
O, Odlar yurdunun cavan övladı,
Təzədən doğuldu odlar içindən.

Qurusun göz yaşı
                    Doğma ananın,
Allahım mərdliyi təsəlli verdi.
...O günəş ürəkli igid oğlanın
Tabutu üstündə Günəş gedirdi.

Bu gün calandıqca
                    Aylar, aylara,
Dünya odlu dəniz – ömürsə gəmi.
Səhər Günəş qonur mərmər məzara,
Yanır qəhrəmanın öz qəlbi kimi.

Yenə də çağlayır
                    Ümmanlar bu gün,
Yenə odlar yanır yer üzərində.
O, xilas etdiyi insanlar bu gün,
Gəzdirir igidi ürəklərində.

Ömr edir ulduzlar sanı, igidlik,
Bəli, əbədidir ani igidlik.

*20 noyabr – 14 dekabr 1997*

## GECƏ...

Sənə – gecən xeyrə qalsın, – deyirəm,
Kaş ki, səni yuxularda mən görəm!

Sən cənnətdən varıb gələn qumrusan,
Mən kölgənəm, bir uçuruq səninlə.
Sən taleyin sehirli bir nurusan,
Ayrılarkən qovuşuruq səninlə.

Bəlkə mənəm pəncərəndən baxan ay?
Buludların gur çayında axan ay?

Zər üfüqlər alovlanıb əriyir,
Səpildikcə cığırlara, izlərə.
Ay elə bil öpmək üçün əyilir,
Mənim öpə bilmədiyim gözlərə.

Varlığımda eşqin dərin həsrəti,
Sanki yatmış duyğularım oyanır.
Doğma-doğma ürəklərin həsrəti,
Ayrı-ayrı üfüqlərdən boylanır.

Ulduzların gur şəfəqi – təbərrik,
Yaxın ulduz, uzaq tale – o bizik?

Görmək üçün o, gözləri bircə an,
Mən gedirəm, qoşalaşır kölgəmiz.
Kainatda bir-birinə uzanan
Ulduzların əlləriyik bəlkə biz?

Nur olsaydım qopub uzaq üfüqdən,
Deməzdim ki, kaman kimi səslənim
Kaş sakitcə incə telə dönüb mən,
Hörüklərin arasında gizlənim.

Gecə keçir, yuxu qaçır, yatmıram,
Səsim çatır, özüm sənə çatmıram.

Sən cənnətdən varıb gələn qumrusan,
Mən kölgənəm, bir uçuruq səninlə.
Sən taleyin sehirli bir nurusan,
Ayrılarkən qovuşuruq səninlə.

*22 yanvar 1998*

## KƏDƏR SÜKUTU

*Dostum **Yəhya Məmmədova***
*təskinlik üçün*

Birdən dodaqlarda
doldu gülüşlər,
Elə bil bürüdü
sükut aləmi.
Dostuma üz verən
ağır bir kədər,
Dostlar çiyninə də
endi dağ kimi.
Bir insan gözünü
Yumdu cahana.
Üç övlad
Bir anda
Atasız oldu.
Ürəkmi vəfasız
Çıxdı insana,
İnsanmı ürəyə
Vəfasız oldu?
Əsdi xəzan yeli
Yaşıl çəməndə,
Güllər ləçəyini
Tökdü sükutla.
Sevinc hay-harayla
Gəlir gələndə.
Kədərsə ürəyə
Çökdü sükutla.
Dost susur...
Baxırsan...
Sən də susursan...
Söz indi tufanlı
Fikirlərindir.
Sevinci bölüşmək.
Nə qədər asan,

Kədəri bölüşmək
Necə çətindir!
O susur,
Dostlar da
Bu yerdə susur.
Paşa dillənməyir,
O pərişandır.
Susmağı sevməyən
Şükür də susur,
Cabir sükutuyla dosta hayandır.
Könüldə o qədər
Sözlər qalır ki,
Axı, necə deyim
Onu dosta mən?
Sükut ürəklərə
Körpü salır ki,
Təskinlik yol alsın
Həmin körpüdən.
...Görür üç övladı
Duman içində.
Susur...
Üzü nurlu...
Baxışı isti...
Oyanır qəlbində
Bir an içində.
Atasız uşağa
Atalıq hissi.

## YUXULAR HƏYATDAN DAHA GÖZƏLDİR

Yuxuda dənizlər aşıb-daşırlar,
Torpağa iz düşür, daşa iz düşür.
Dalğalar sahillə pıçıldaşırlar,
Mirvari qumlara qoşa iz düşür.

Uçub qovuşursan uca buluda,
Tor gəlmiş gözündən çəkilir duman.
...Əl çatmaz dünyaya gedib yuxuda,
Gənclik illərilə qovuşur insan.

Üz-üzə durursan sən Günəşlə də,
Səadət durnanın telində gəlir.
Hərdən görüşürsən, ilk görüşlə də,
Evə ağ duvaqlı gəlin də gəlir...

Yetimlik köç edir ömürdən bəzən,
Yenə doğma ana tutur əlindən.
Nə böyük aləmdir analı yuxu,
Mənasız cahanda mənalı yuxu.

Axdı gözlərindən yaş gildir-gildir,
Yuxudan oyandın... yenə tənha-tək.
Dünyanı dəyişmək dəhşət deyildir,
Dəhşətdir bir daha yuxu görməmək.

*29 dekabr 1992*

## ƏLVİDA

Əlvida, ömrümdən ötüşən bir il,
Gözəl önündəki, heyrət, əlvida!
Əlvida, dalğalar, əlvida, sahil,
Çəkdiyim əzablı həsrət, əlvida!

Əlvida, ey yaşıl çinar kölgəsi,
Çinarın sehirgar səsi, əlvida!
Əlvida durnanın uzaq nəğməsi,
Qəlblərin sükutu, sözü, əlvida!

Əlvida, qumlarda sirli naxışlar,
Sahillərə düşən izlər, əlvida!
Əlvida, mehriban, nurlu baxışlar,
Hərdən o süzülən gözlər, əlvida!

Əlvida, göy meşə, çal-çarpaz budaq,
Vaxtsız doğulmusan, ey baxt, əlvida!
Əlvida hər şeyə, hər şeyə, ancaq,
Sevgimə demərəm heç vaxt: əlvida!

*6 yanvar 1993*

## QAYA ÜSTDƏ TƏK PALID

Yarğan başındakı
                    boz qaya üstdən,
Vüqarla yüksəlir qoca bir palıd.
Ayağı altından axır duman, çən,
Başıyla göylərə dirənir palıd.

Onun toxumunu hansı bir səhər,
Qartallar gətirib buraya salmış.
O həyat aşiqi,
                    görən kim deyər,
Neçə vaxt daşların qoynunda qalmış?

Ancaq təbiətə yaz gələndə o,
Oyanmış yuxudan dağlarla birgə.
Dağlardan ucalan qatı çəndə o,
Boylanmış qayadan baharla birgə.

Qoy gəlib mən ona
                    yaxından baxım,
Şahidi neçə yaz, neçə də qışdır.
Bəli, hikmətə bax, kiçik bir toxum,
Böyük bir qayanı parçalamışdır!

Qalxmış məhəbbətlə günəşə doğru,
Üstündən heç zaman nur əskilməmiş.
İti əsən külək, coşğun axan su,
Onun vüqarını əyə bilməmiş!..

Bu gün çiçək açmış yalçın qayada,
Onun dağ ürəyi, onun dağ eşqi.
Nə ilə ölçülər görən dünyada,
Həyat məhəbbəti, yaşamaq eşqi.

*1956*

## ŞUŞANIN YOLLARI

Hər yanda bir məclis qurulub gedir,
Buz kimi bulaqlar durulub gedir.
Dağların döşüylə burulub gedir,
Gör necə qovuşur yollara yollar,
Siz nə gözəlsiniz, yollar, a yollar!

Dağın ətəyinə qədəm qoyunca,
Qarqar uğuldayır dərə boyunca.
Durub hüsnünüzə baxım doyunca,
Baxım heyran-heyran mən sizə, yollar!
İlk dəfə gəlmişik üz-üzə, yollar!

Sərin bulaqlardan ellər su içmiş,
Dostunu düşməndən yaxşıca seçmiş.
Burdan Vaqif getmiş, Vidadi keçmiş,
Gərək ki, onları tanıya yollar,
Onların ləpiri hanı, a yollar?

Sevirəm çeşməli, sulu dağları,
Vüqarlı dağları, ulu dağları.
Döysə də qar, yağış, dolu dağları,
Dolanıb aparır dağlara yollar,
Baxçalara yollara, bağlara yollar.

Dağların zirvəsi ağa bürünür,
Yaşıl qüzeylərdən duman sürünür.
Qəlbimdən bu yerə yollar görünür,
Gör necə qovuşur yollara yollar,
Siz nə gözəlsiniz, yollar, a yollar!

*1954*

## ÇƏKİN QARABAĞDAN QARA ƏLLƏRİ

*Dostum, qardaşım **Yasif Nəsirliyə***

Sinəmdə döyünür bu yerin qəlbi,
Əyilməz dağlara bir də baş əyim.
Vaqifin ürəyi,
                    Üzeyrin qəlbi
Mənim ürəyimdir, mənim taleyim.
Əsməsin hicranın
                    qara yelləri,
Çəkin Qarabağdan qara əlləri!

Quzeydən çaylara göz yaşı sızır.
Qəzəb dalğaları axır yollara.
Yurdumun xan qızı,
                    mehriban qızı,
Natəvan nigaran baxır yollara.
Axmasın vadinin
                    qara selləri,
Çəkin Qarabağdan qara əlləri!

Dar gündə sınanar nəslin qüruru,
Qeyrət həqiqətin müqəddəsidir.
Fikrətin xəyalı –
                    zirvələr nuru,
Bülbülün nəğməsi dağlar səsidir.
Bir də mən görməyim
                    qara illəri,
Çəkin Qarabardan qara əlləri!

Kükrəyib qəzəbdən od tökər qışım,
Qolumdan bərk tutsun qardaşım gərək.
Qarışsa yad elə
                    bircə qarışım,
Özüm də torpağa qarışım gərək.
Çəkin bu torpaqdan
                    qara əlləri!
Çəkin Qarabağdan qara əlləri!

*1988*

## QEYRƏT

Bu gün dərd ağırdır, yaralar dərin,
Sən düşmən üstündən tufan olub keç.
Deyin, qarşısından nakişilərin
Qaçmaq kişilərə yaraşarmı heç?

Atan sevdi xalqı, bilirsən özün,
Keçdi qanlı əsrin boranlarından.
Söylə kimdən qorxub, qaçırsan bu gün
Dünyanın ən qorxaq insanlarından?

Mərdlərə söykənər Vətən dağ kimi,
Döyüşsün kimin ki, qeyrəti varsa.
Cahanda ən böyük bəla deyilmi,
Ordu qaçqınlardan əvvəl qaçarsa?

Bu bir həqiqətdir düşüb dillərə:
İgid bir yol ölər, qorxaq min kərə.
Niyə belə oldun, sən harda, haçan?
Getmişdin igidlər sırasında sən.
Cəbhədən dabana tüpürüb qaçan,
"Mərdsən" piştaxtalar arxasında sən!

Erməni baş kəsər, heç "uf" da deməz,
Bu gün haray çəkir kəndlər, uluslar.
Söz var ki, namusu itə at, yeməz!
Namusa susayıb bu binamuslar.
Xalqın namusudur Vətən torpağı,
Hər şeydən ucadır namus bayrağı.

Qalxsın qoy özünü insan sayanlar,
Bizdədir mətanət, bizdədir dözüm.
Dünən qapımızda qab yalayanlar,
Bu gün qanımızı içsinlər bizim?!

Xəyala dönməsin ləyaqətimiz,
Axı namus, ismət tapdanır bu gün.

Bizim özümüzə xəyanətimiz,
Hünərə çevrilir düşmənlər üçün.

Qoy daha düşməsin vicdana ləkə,
Get el keşiyində dur ayıq-sayıq.
Vermişik torpağı biz bölgə-bölgə,
İndi qarış-qarış qaytarmalıyıq.

Ellər uca tutub öz vüqarını,
Haqqa, sədaqətə o təməl qoyub,
Burda igidlərin qılınclarını
Qeyrət suvarmışdır əsrlər boyu.

Şair, sən də yurdun keşiyində dur,
Vətən müqəddəsdir, Vətən əzizdir.
Bizə bizdən başqa bir arxa yoxdur,
Bizim qüdrətimiz qeyrətimizdir!
Bizim qeyrətimiz qüdrətimizdir!

*1993*

## CƏBHƏDƏN QAÇAN OĞLAN

O cəbhədən qaçıb gəldi,
gəldi ata evinə,
Döydü doğma bir qapını
o sevinə-sevinə:
– Ana!
– Necə qapı açım
mən cəbhədən qaçana?
– Mən gəldim ki, sizi görüm.
– yox, buna dözməz Ana.
Sənə Hünər adı verdim,
mən arzuma yetmədim.
İgid oğul bəslədim mən,
fərari böyütmədim.
Oğul, qayıt tez cəbhəyə,
boyuna qurban olum,
Səni görmək istəmirəm
fərari tək, ay oğlum.
Gedir cavan...
Kor-peşiman...
tanış yola düzəlir.
Sonra döyür bir qapını...
o qapıdan səs gəlir
– Kimsən?
– Mənəm.
– Qaçmısanmı?
qız dedi qəlbində qəm:
– Mən fərari sevməmişəm,
mən qəhrəman sevmişəm.
Gedir cavan...
Kor-peşiman...
"Bu nə işdir" – deyir o,
Yolda tanış bir dükanın
qapısını döyür o,
Bir ucaboy oğlan çıxır,
üzü gülər, səsi şən:

– Ə, bu sənsən, köhnə dostum,
əcəb edib gəlmisən!
Olub burda biz şərik,
bala-bala işlərik.
Yol ustundə taxta dükan –
şamların kölgəsində,
Elə məşum haray var ki,
küləklərin səsində.
O haraya gedirdisə
özünü yad sanırdı,
Ayağının altda sanki
yer od tutub yanırdı.
O, hər kəsdən gizlənirdi,
qəlbdə günahı, suçu.
O gündüzlər satıcıydı,
gecələr qarovulçu.
Gör xəyanət edən zaman –
necə alçalır insan!
Bir gün elə yağış yağdı,
şiddətli sellər axdı.
Göy şamların zirvəsində
odlu ildırım çaxdı,
Bir də şimşək çaxanda
şam da yandı, dükan da.
Hayla gələn vayla getdi –
bircə anın içində,
Fərari də külə döndü
o dükanın içində.
Namərd oğul cəbhələrdən
qaçıb gəldi, nə gördü?
Fərarinin cəzasını
təbiət özü verdi.

*4-5 noyabr 1993*

## ÇADIRLAR

Suları çağlayan
                    ümman səhrada,
Ağappaq adadır hər titrək çadır.
Əriyir tüstü tək
                    duman səhrada,

Çadıra söykənir sıra çadırlar.
Üfüqdən üfüqə gedib çatırlar.
Elə ki küləklə ağ qar ələnir,
Səhrada dəhşətli haray səslənir.

Qaçqınlar su üçün qaçır obaşdan,
Yollarda palçığa, zığa batırlar.
Soyuqdan, küləkdən, qardan, yağışdan
Onlar çadırlarda necə yatırlar?

Uşaq "çörək" deyə qəmli dayanmış,
Gözlər yol çəkməkdən alacalanmış.

Titrəyib dəhşətli yellər önündə
Hər ürək – elə bil yaralı bir quş.
Dörd yandan axışan sellər içində
Ananın döşündə südü qurumuş.

Bədənlər nə dəmir, nə də ki, tuncdur,
Ən zəif canlıdır zərif canlılar.
Soyuq tufandan da daha qorxuncdur,
İnsan taleyinə soyuqqanlılar.

Onlar kefə baxır – azacıq gendə,
Vurur bala-bala, deyib gülürlər.
Bura humanitar yardım gələndə,
Bizim "humanistlər" yarı bölürlər.

Ey qar, qış gəlməmiş niyə yağırsan?
Torpaqlar ağappaq, sular qapqara.

Sən də göy qübbəsi!
　　　　　　　　mavi çadırsan
Rəhm elə yerdəki boz çadırlara!

Kaş mən öz köksümü
　　　　　　　　yara biləydim,
Bu dərd də mənimdir, bu qəm də mənim.
Kaş elə bir çadır qura biləydim,
Hamı isinəydi sinəmdə mənim.

*12 dekabr 1993*

## İSTİQLAL MARŞI

Göz açdığım qədim torpaq,
Dayağımsan sən dünyada.
Doğma anam, ey mehriban,
Ey qəhrəman, Azərbaycan!
Addım-addım qucağından,
Odlu sellər çağlasa da.
Həsrət qaldın sən işığa,
Zaman-zaman, Azərbaycan!
Yadellilər damla-damla
Al qanını sordu sənin,
Kimlər sənin göz tikmədi
Torpağına, Azərbaycan!
Bayrağını endirdilər,
Ancaq özün əyilmədin,
Alqış bu gün o ucalan
Bayrağına Azərbaycan!
Səhər kimi cavan sənsən,
Tarix kimi qoca sənsən.
Fatehləri diz çökdürən,
Vüqarımsan, Azərbaycan!
Öz müqəddəs dağlarından,
Günəş kimi uca sənsən.
Yer üzündə mənim Odlar
Diyarımsan, Azərbaycan!
Səhərlərin qoy açılsın,
Təzə nurlu bahar ilə,
Gələcəyə mərd addımla,
Uğurla get, Azərbaycan!
Şəhidlərin al qanından,
Lalə açmış yollar ilə,
İstiqlalın sabahına
Qürurla get, Azərbaycan!

*1991*

## DƏHŞƏT NƏDİR?

İrişmək hörmət deyil,
　　　　　　səmimi söz hörmətdir.
Dil deyən dəhşət deyil,
　　　　　　ürək deyən dəhşətdir,
Ah çəkmək həsrət deyil,
　　　　　　dərdə dözmək həsrətdir.
Bağırmaq cürət deyil,
　　　　　　susan mərdlik, cürətdir.
Hay-haray nifrət deyil,
　　　　　　qisas almaq nifrətdir.
Söz hələ qeyrət deyil,
　　　　　　xeyirxah iş qeyrətdir.
Bağırmaq şöhrət deyil,
　　　　　　səssiz gələn şöhrətdir.
Yığdığın sərvət deyil,
　　　　　　payladığın sərvətdir.
Vəsf etmək heyrət deyil,
　　　　　　səcdə etmək heyrətdir.
...Dil deyən dəhşət deyil,
　　　　　　ürək deyən dəhşətdir.

*8 yanvar 1993*

## XOCALIDA ƏRİK AĞACI

*"Atamı, anamı Xocalıda öldürdülər. Ərik ağacımızı yandırdılar... İndi yuxularda həmişə ərik ağacımızı çiçəkləyən görürəm"*
***Qızcığazın dediklərindən***

O, yandı, atəşi
tutdu aləmi,
Endi yerə Günəş –
göylərin tacı.
Qanlı cinayətə
abidə kimi,
Yüksəldi qapqara
ərik ağacı.
Rəzalət səsləndi
bütün cahanda,
Bu alçaq adına
yaraşır ancaq!
Ağac sahibinə
güc çatmayanda
Ağacın özündən
intiqam almaq!
Sən ey həqiqəti
unudan yağı,
De, nə edəcəksən
bəs qisas çağı?
Qışın yuxusundan
oyandı torpaq,
Dünyanın gözləri
ərikdə qaldı.
– Bahar – nəfəsini
dünyada torpaq,
Köklərdən
bir şiv ucaldı.
Əziz anasıdır

Vətən – ağacın,
Ana gözlərinin
yaşı dayanmır.
Doğma torpağında
bitən ağacın,
Budağı yansa da,
kökləri yanmır.
Əriyin bir yeni
budağı doğdu.
Budağa ana tək
süd verdi köklər.
Ucaldı səmaya,
günəşə doğru,
Gəldi bu torpağı
səcdəyə göylər.
Bir ayda boy atdı
budaq bir qulac,
Dağ onu oyatdı
öz nəfəsiylə.
Dünən yuxularda
gül açan ağac,
Bu gün çiçəklədi
yaz nəfəsiylə.
Yad gözlər ağaca
kinlə baxdı ki...
Əllər göy budağı
kəsməyə gəldi.
Göylərdə elə bir
şimşək çaxdı ki,
Şivlər kəsilmədi,
əllər kəsildi.
Çiçəklər torpağın
arzu-kamıdır,
Gündüz də düşmənçin
gecə olacaq...
Bu hələ təbiət

intiqamıdır,
Gör insan qisası
necə olacaq!
Qızım, körpə budaq –
çiçək açdıqca,
Qəlbin ora qonan
göyərçin oldu.
Günəş yolumuza
işıq saçdıqca,
Sənin yuxuların
qızım, çin oldu!

*1992*

## ŞUŞA

Ah çəkir, hay salır dərdli meşələr.
Millətin görəcək günləri varmış.
Mərdlik üzərində ucalan şəhər,
Satqınlıq önündə gücsüz qalarmış.

Dedi göylər də ağı,
Rəngi rəngə qatdılar.
Bu ziqiymət torpağı
Nə qiymətə satdılar?

Buludlar halay çəkir,
Solur təzə pöhrələr.
"Ərimgəldi" hay çəkir,
Uğuldayır dərələr.

Uca dağları da bu gün yaş boğur,
Qayadan yetim tək baxır qalalar,
Nə orda gözləyən bir gəlin durur,
Nə çarpaz yollarla gələn bir ər var.

Namus tapdalandı biz necə dözdük,
Yer yandı, göy yandı biz necə dözdük.
Dözdük...
Günahkarı biz özümüzdük.

Deyin mən bu dərdi
Çəkim nə qədər.
Ahımdan asiman qoy parçalansın!
Günəşlə yanaşı duran bir şəhər,
Zülmət övladının əlində qalsın?
Vaqif məzarında gəldi dəhşətə,
Daşaltı küləyi – pərişan ruhu.
Görən necə dözdü bu xəyanətə,
Üzeyir gəncliyi, Natəvan ruhu.
Yaşıl kölgəlikdən süründü ölüm,
Gözəllər əlvida dedi həyata.

– Ata, öldür məni qurbanın olum,
Ölüm-əsirlikdən xoşdur, ay ata!
Ata səndirlədi, titrədi durdu,
Bir güllə qızına,
Bir güllə özünə
Gözləri yaşaran o ata vurdu,

Dünyaya bəxş etmiş
                    öz övladıyla
O getdi dünyadan qeyrət-adıyla.
Eşitdim, qəlbimdə
                    qanım da dondu.
Bir nəslin isməti
                    belə qorundu.
Fikir asır məni dardan
Dönə-dönə bu gün, Allah!
Uca Şuşam yuxulardan
Həqiqətə dönsün, Allah!
Qovub yadı torpağımdan,
Xalqım qisas alsın, Allah!
Sərçələrin caynağında
Laçın necə qalsın, Allah!

Qaytar cahi-cəlalımı,
Uca Allah, qadir Allah!
Yerlə-yeksan Xocalımı
Zirvələrə qaldır, Allah!

Milyon qərinədir,
                    min qərinədir.
Vicdan üfüqümüz safdır, təmizdir.
Biz indi bildik ki,
                    satqınlıq nədir:
Kürəyə sançılan öz gülləmizdir.
Sözlərim bitməyir... Susmur haray, ah!
Xəyalən gəzsəm də beş qitəni mən,
Öz Şuşa qitəmə qayıdıb sabah,
Qoyaram şerimə son nöqtəni mən!

*1992*

# BİR ÖMRÜN ƏVVƏLİ, BİR ÖMRÜN SONU

(*Dostumun kədərli monoloqu*)

## I

Məktəbə gedirdim,
                    sütül uşaqdım.
Çevrilib bir qıza həsrətlə baxdım.
Gözəl üzündəki gözəl qürurdu.
Deyərdin yerimir o qız uçurdu.
Bizim küçəmizdən keçib gedəndə,
Qəribə duyğular doğurdu məndə.

Məktəbdən çıxanda burdan keçirdi,
Burda yaşayırmış əmisi onun.
Fəqət bu günədək, bu necə sirdi,
Nə qızı görmüşdüm,
                    nə qohumunu!

Oturub müasir bir Məcnun kimi,
Tökdüm varaqlara fikirlərimi.
"Pakizə" deyərək,
Döyündü ürək:
"Məktubu mən ona çatdırım gərək".

Bəs necə, nə təhər?
Coşduqca hisslər,
Sirrimi dostuma açdım bir səhər.
Söylədi: "Bəri ver, mən ölməmişəm,
Sadiq dost olmuşam sənə həmişə".
(Artıq dərd verərmiş artıq inam da,
Sadəlövhlük olub ilkin bəlam da).
...Mən sabah erkən
Dərsə gedirkən,
Qızın qardaşları kəsdi qarşımı.
Onların əlində bıçaq, daşdımı?

Ürəkdə titrəyiş,
canda sızıltı,
Eşqim torpaqlara qanla yazıldı.
Fırlandı başıma
dərə də, dağ da,
Durmuşdu "Sadiq dost" azca uzaqda.

Tək mən döyülmədim, döyüldü sevgim,
Tək mən söyülmədim, söyüldü sevgim.
Söyüldü, tapdandı, yellərə getdi,
Acısı aylara, illərə getdi.
Sızladım ürəkdən mən yana-yana,
Bir gün qulaqlarım nələr eşitdi?
Qız ərə getdi.
Bilmədim qüruru bəs hara getdi?

**II**

Bu gün yenə məni eyni bir adla,
Tale imtahana çəkir inadla.
Eşit ürəyimi, bəyzadə xanım,
Özü də, sözü də, ey sadə xanım!
İlkin səni gördüm, uzaq bir ildə,
Mərdanə dostumun dayısıgildə.
Dayandım heyrətlə,
Baxdım riqqətlə.
Baxmağa hüququm yox idi, baxdım,
Elə bil sehirli yuxuydu, baxdım.
Mən susdum, qarşımda ilahə durdu,
Gözlər gözəlliyi görməsə kordur!
Sənin taleyinə gəldi tufanlar,
Sevincə şərikdi ahlar, amanlar.
Ürək can atırkən ağ gündüzlərə,
Tale kədər səpdi qara gözlərə.
Dünyanı nə rəngdə,
nə gündə gördün?
Nagah qara gələn düyün də gördün!

Sənə qanad verdi sənin iradən,
Mətin iradən!
Hər şey dəyişsə də yer kürəsində,
Təkcə dəyişmədi gözəllik səndə.
Çox vaxt sevinc yatır,
                    kədər ayıqdır,
Ağıllı gözəllik baş ucalıqdır.
Şəfa da tapmışam ağır gündə mən,
O zərif əllərin mərhəmətindən.
Bəlkə də "Pakizə" adlı məhəbbət,
Dünən xəyal imiş, bu gün həqiqət.
Bir ömür yol keçdim, qəlbdə Pakizə,
Dedim ki, pak sevgi düşsün pak izə!
Bir ömrün əvvəli, bir ömrün sonu,
Yerlər, göylər qədər fərq duysam da mən,
Taleyin döydüyü insan oğlunu
Döyən olacaqmı bu gün görəsən?
Mən dünya üzündə nə qədər varam,
Varam alnı açıq,
                    varam üzü ağ.
Heç nədən, heç kəsdən mən ki, qorxmuram,
Amansız taledən qorxuram ancaq!
İstərdim səsimi qəlbin eşitsin,
Əyər eşitməsə, Sən bir nəfəsə,
Oxuyub məktubu cır, tulla getsin.

Hər varaq parçası onda, Pakizə,
Quş tək qanad açar gedər-gəlməzə.

*16-20 noyabr 1993*

# NECƏ VİDALAŞAQ, DÜNYA, SƏNİNLƏ

Bəlkə son gün gəlir,
gəlir son axşam,
Bəlkə son şerimi yazıram, dünya!
Dünyadan dörd əlli yapışmamışam,
Lap sabah köçməyə
hazıram, dünya!
Ümid məcrasını
qəmə çevirdin,
Sevgi astanama sən kölkə salma.
Dözdüm, saçlarımı
yellərə verdin,
Sən barı gözümün nurunu alma.
Sənin əzabına
can gərək dözə,
Gözlərdən axsa da yaş gildir-gildir.
Əzabsız sevgilər
sevgi deyilsə,
Əzabsız dünya da dünya deyildir!
İllər şəlalə tək
şaqraq axırsa,
Dərə günahsızdır,
qaya günahsız.
Sevgi məhvərindən
bəşər çıxırsa,
İnsan günahkardır, dünya günahsız.
Dünya, nura çevir insan ömrünü,
Ümid qapısını
aç aram-aram.
Sevgi, məhəbbəti itirən günü,
Əcəli könüllü çağıracağam.

*29 may – 5 iyun 1994*

## HƏM ÖLÜM, HƏM ƏBƏDİYYƏT

Qarşıda çağlayan mavi dənizdir,
Ordan bir mavi yol uzanır göyə!
Dalğalar dilində ilahi sözdür,
Uçur səmalara "sevirəm" – deyə.

Sevgin üfüqlərdən endi mənimçin,
Bənzərdim dənizdə tənha yelkənə.
Ürəkdən ağlasam mən için-için,
Mehriban-mehriban gülmə sən mənə.

Ömrün ayrı-ayrı iziylə keçdik,
Dərdlər də, qəmlər də bizə bəllidir,
Bilirəm cahanda çox gec görüşdük,
Yaxşı ki, görüşdük, bu təsəllidir.

Ümid körpüsündən həsrətlə keçdim,
Sevgi qapısını döydüm bir sabah.
Təəccüb doğurdu gözlərdə eşqim,
Təəccüb heyrətə dönərmi, Allah?

Yenə bir mavi yol uzanır göyə.
Ürəkdə torpağa, səmaya heyrət.
Sevgisə sirrini açmır kimsəyə:
Sevgi həm ölümdür, həm əbədiyyət!

*30 dekabr 1993*

# SƏN MƏNİ ÖLDÜRDÜN,
# MƏNİ DİRİLTDİN

Mənim qəlbimdəykən
                    sən hara getdin?
Sandım ki, əlvida dedim dünyaya,
Sonradan qaldıran
                    Günəşə, Aya,
Sən məni öldürdün, məni diriltdin.
Yolumda ətirli
                    gül kimi bitdin,
Tikanlar ucaydı,
                    budaqlar qısa.
Çırpıldım küllərə
                    qan sıza-sıza,
Sən məni öldürdün, məni diriltdin.
Bəlkə sən beləcə
                    arzuna yetdin?
Mənsə vida dedim ümidlərimə.
Xoş sözlə son qoydun
                    son kədərimə,
Sən məni öldürdün, məni diriltdin.
Sən özün bildinmi
                    heç nələr etdin?
Öldürüb bağladın həyata məni,
Diriltdin – çox sevim
                    daha da səni,
Bununçun öldürüb məni diriltdin?
Niyə öldürürsən dirildəcəksən?
Niyə dirildirsən, öldürəcəksən?

*29 may – 5 iyun 1994*

## NİYƏ GECİKDİNİZ, DURNALAR, NİYƏ?

Səma yolçuları,
həsrət gözlərəm,
Bu qədər gecikmək olmaz, durnalar!
Sizi üfüqlərdə gəzər gözlərim,
Niyə gəlməzsiniz bu yaz, durnalar!

Hər il səmalarda sıralandıqca,
Gəldi qanadınız üstündə bahar.
Sonsuz mavilikdə misralandıqca,
Bir şeir səsləndi sözündə – bahar.

Zillənib göylərə
büllur göz kimi,
Sizi durna gözlü göllər gözləyir.
Hər il ilahidən düşən iz kimi,
Tellər saldığınız çöllər gözləyir.

Gəlin, durnalarım,
tarix iziylə,
Dünəndən bugünkü əsrədək, gəlin!
Füzuli arzusu, Vaqif sözuylə,
Yollanıb Bağdaddan, Bəsrədən, gəlin!

Zamanın zəhəri
çöksə də yerə,
Ağ səma çayı tək axın, durnalar!
Bəlkə dözmək oldu çirkli göllərə,
Qara ürəklərdən qorxun, durnalar!

Qarabağ gözlərdi gəlişinizi,
Hər il yol çəkərdi dağların gözü.
Bu gün yanan evlər, –
Barıt qoxusu,
Nagahan açılan

Güllə qorxusu
Bəlkə pərən-pərən eyləyib sizi?

Ölüm gəzən yerdə,
                    gəzərmi durna?
Qan sızan sularda,
                    üzərmi durna?
Birdən səs eşitdim...
Ona hay verdim.
Deyin, bildinizmi, gözüm yoldadır?
Bu gün durnaları yuxuda gördüm,

Uçur durnalarım gördüm, yoldadır!
İnsanlar! Dayanın!
                    Siz məğrur, uca,
Başınız üstündən durnalar gəlir,
Onlar qitə-qitə qanad çaldıqca,
Görüşə ölkələr, dünyalar gəlir!

Göyləri ayna tək
                    Silir durnalar,
Necə büllürlaşır sonsuz bir aləm.
Şahanə ləngərlə gəlir durnalar,
Hara qonacaqdır deyə bilmərəm.

*1993*

## ŞUŞA GƏLİR YUXULARIMA

Gecə... Səksəkəli uyuyur aləm,
Uzaq xatirələr
yaxına gəlir.
Bu gün mən Şuşaya gedə bilmirəm,
Bu gün Şuşa mənim yuxuma gəlir.

Uca göylərin də ağır dərdi var,
Sanki göz yaşıdır axan ulduzlar.
Zirvələr örtülüb
qara buludla,
Solub təbiətin əlvan rəngləri.
Baxır minarələr qəmli sükutla,
Dağlara hay salır kilsə zəngləri.

Bir vaxt durdu məni salama yollar,
Lalədən çıraqlar yandırdı mənə.
Bu gün yadlar keçən dolama yollar,
Əyri bir qılıncı andırır mənə.

Sərindir dağların
yenə küləyi,
Günəşdən qaranlıq çökür gözümə,
Doğma Daşaltının tənə küləyi,
Sanki şillə kimi dəyir üzümə.

Tanışam zirvənin
erkən qarıyla,
Məndən uzaqlaşan o kölgə nədir?
Keçir əsrlərin cığırlarıyla,
Vaqif də üzümə baxmayıb gedir.

Dağlarda bir solmaz
xəyal yaşayır,
O kimdir
əlinə külüng götürüb.
Pənah xan bu yerə daşmı daşıyır,
Təzədən Şuşanı tikməkdən ötrü?

Göründü xan qızı,
                    nisgillə dindi,
Sandım hər sözündə ildırım çaxır.
"Çəkdiyim bulaqdan su gəlmir indi,
Çəkdiyim bulaqdan göz yaşı axır".

Üzeyrin üzündən
                    sis-duman keçir,
Bülbüllə yanaşı addımlayırlar.
Ulular pərişan-pərişan keçir,
Yoxsa ki, məni də satqın sayırlar.

Bu gün hərislərin
                    doymur gözləri,
Neyləsin ulular,
                    bilmir ki, onlar
Şuşanı hərraca qoyan kəsləri,
Göylərdə gəzdirir hələ milyonlar.

Susubdur "Şikəstə",
                    dinmir tar simi,
Ürəklər payına qəzəb-kin düşüb.
Elə bil bəlalı qaçqınlar kimi,
Burdan "Muğamat" da didərgin düşüb.

Şuşam, uca tutdm
                    səni ana tək,
O yerə quş kimi qanad açmışam.
Üç rəngli bayrağım ucalanadək,
Sevgimi bayraq tək ora sancmışam.

Sabah Şuşadayam,
                    bu, ulu haqdır,
Yuxum şübhə yox ki, çin olacaqdır!
Zəfər səslənəcək inanıram mən,
Mənim Vətən adlı kainatımda.
Şuşaya doğmalar dönüb gələrkən,
Dönüb qayıdacaq "Muğamat"ım da.

*6 noyabr 1993*

## QOŞA ÇİNAR ƏKDİM...

O qoşa çinardı fəxrim, vüqarım.
Otuz il bağçamda
                  çaldı nəğməmi.
Bu bahar quruyan göy çinarlarım,
Durdu özlərinə
                  heykəllər kimi.
Doğma torpağımda bu hikmət nədir?
Qurumuş çinar da bir abidədir.

*5 iyun 1994*

## MƏHBƏSDƏ YAZILAN KİTAB

*İnsana doğulan gün*
*Ölüm hökmü kəsilir.*
***N.Xəzri***

Açıram səhəri sönən bir şamla,
Sehirli həb kimi qəm uduram mən.
Allaha inamla, haqqa inamla,
Zülmət məhbəsimi unuduram mən.

Sükutu özünə könlüm dost sayır,
Qitədən qitəyə qəlbən köçürəm.
Nəsə yer söyləyir, göy pıçıldayır;
Onları kağıza mənəm köçürən.

Cansıxan məhbəsin pəncərəsindən,
Bir ulduz danışır, mənimlə ulduz,
Ruhuma nur axır ağ şöləsindən,
Deyirəm qəlbimi sən dinlə, ulduz!

Ömür tək beləcə əriyir gecə,
Ömrün də sonuna ilk cavabam mən.
Öz edam günümü mən gözlədikcə,
Məhbəsdə yazılan bir kitabam mən.

*31 dekabr 1992*

## HACI ZEYNALABDİN ÇİLÇIRAĞI

(*Kərbalada*)

Hər çıraq bənzəyir mavi bir aya,
Ayın da göy rəngli xalları vardır.
Sanki avizələr səpdikcə ziya,
Zəncir çiçəyinin salxımlarıdır.

Tavanı heyrətlə seyr etdikcə biz,
Səslənir dostların sözü mehriban.
– Onları göndərib sizin yerliniz,
Hacı Zeynalabdin – xeyirxah insan.

Necə doğmalaşdı onun ziyası,
Qoy ürək söyləsin öz qürurunu.
Xalqıyçın o yanan millət atası,
Müqəddəs yerə də səpib nurunu.

İsindi könlümüz qanad açaraq,
Rəhmətlik babamız, bu nəcib işdir.
Harda düzəlsə də nadir çil-çiraq,
Atəşi Bakıdan gətirilmişdir.

Ucalsın, ucaldan doğma diyarı,
El onu eşqiylə gərək bəsliyə.
Odlar ölkəsinin haqq alovları
Qovuşub bu yerdə müqəddəsliyə.

*20 dekabr 1992*

## ÇARMIXA ÇƏKİLMİŞ KÖRPÜ

Ömrün ağır gedir karvan illəri,
İntizar quş olub qoy uçsun – dedim.
Mənim qəm çayımın dərd sahilləri,
Tale körpüsündə qovuşsun – dedim.
Kökü dərin olsun,
                    qanadı uca,
Onun özülünü qanımla tökdüm.
Ömür daşlarından körpü saldıqca,
Sandım, kədərimi çarmıxa çəkdim.
Töküldü ulduzlar
                    kahkəşan kimi,
Sanki yerə çökək dumandı körpü.
Qolları gen açan bir insan kimi,
Sahildən-sahilə uzandı körpü.
Birdən körpü kimi
                    gördüm tənhayam,
Artıq sona çatmış bir dözüm oldum,
Dünyaya əlvida deyən dünyayam,
Çarmıxa çəkilən mən özüm oldum.
Çox baxdım, bilmədim heç bu sirr nədir,
Körpüylə – dünyadan
                    köçənlər gedir!
Torpağı səmaya calamaq üçün,
Toxundum günəşin məhrəm əlinə.
Öz kədər körpümü mən atdım bu gün,
Dünya sahilindən göy sahilinə.
Qollarım ulduzla ay arasında,
Özüm də ulduzam, yoxsa nəyəm mən!
Deyirəm yer ilə göy arasında,
Çarmıxa çəkilən bir körpüyəm mən
Sinəm geniş yoldur,
                    bilməyən bilsin.
Kaş mənim körpümlə
                    gedənlər gəlsin!

*1991*

## ANA DİLİM

Qəlbimin atəşi
alışar, sönməz,
Olub keşməkeşli
əsrlər, illər.
Bir dilim var mənim –
zəngin, müqəddəs,
Əsibdir üstündən
həmişə yellər.
Məni düşündürür
bu mənalı sirr,
Hara gedəcəkdir
sözün mənzili?
Türk qardaş Azəri türkcəsi deyir,
Biz isə deyirik mütləq türk dili...
Uludur söz qəlbə
həmahəng olsa,
Dil xalq ürəyinin ənginliyidir.
Qardaş dillərimiz
rəngarəng olsa,
Bu qardaş dillərin zənginliyidir,
Biz türkük, hər türkün
doğma eli var,
Hər türk xalqının da
öz xalq dili var.
Dahilər yurdudur, Odlar ölkəsi.
Elə millətik ki, qəhrəman, qədim...
Gəlir Çaldırandan
Xətai səsi:
Hanı Dövlət dili elan etdiyim?!
Vaqifə bağlıyam
taleyim kimi,
Onda ucalıq da,
dərinlik də var.
Sabirdən, Vurğundan
üz döndərəkmi?

Onlar xalq danışan
dildə yazıblar.
Müşfiq! Qoy şairlər sırasında o,
Qalsın bu dillərin arasında o,
Xalqın ürəyindən
qəm çəkilərmi,
Xalqın ürəyindən
gəlməsə qanun,
26 nəfər yaza bilərmi.
Qəti taleyini neçə milyonun?!
Yox, dil əsrlərin
tale səsidir,
Azərbaycan dili –
Büllur bir bulaq...
Dil xalqın adıdır,
Xalqın özüdür.
Dilin ixtiyarı
Xalqdadır ancaq...

*23-26 dekabr 1993*

## EHTİYAC...

O necə duyğudur
dünya üzündə,
Dinmişəm,
dillənib,
gülmüşəm, gülüb,
Bəlkə mən
cahana gəldiyim gündə,
Elə ehtiyac da mənimlə gəlib?
Arzu sahilsizdir
asiman kimi,
Uçmuşam ümidin qanadlarında.
Qalmışam bir şeri
qurtaran kimi,
Başqa bir şerimin
intizarında,
Bitib-tükənsə də
Saz ehtiyatım –
Bitib-tükənməyib
Söz ehtiyacım!
Günəşə üz tutdum,
işıq istədim
Aydan şeir yazdım –
mən aya möhtac.
Sən yaşa, ilk eşqim,
son səadətim,
Dünyadan getsəm də dünyaya möhtac
Nə qədər ummanlar
gördüm cahanda,
Mən qaldım Xəzərsiz
dənizə həsrət.
Qəlbimdə ilhamım
aşıb-daşanda
Min sözüm dilləndi
bir sözə həsrət!
Xoş bir söz istədim –

Bir qanad kimi.
Qəbul eyləməkçin
Mükafat kimi!
Sızdı ürəyimdən
söz damla-damla,
Eşqin şərbətini
mən erkən içdim,
Sevgi –
O əbədi
ehtiyacımla,
Ömrün yollarını mən qoşa keçdim.
Aldım ucalığı
göy çinarımdan,
Gördüm çinarımla
mən kainatı...
Gül dəstə bağladım
misralarımdan.
Sanki bir çiçəyim
yenə çatmadı.
Əsrim də ucaldı,
Mən də ucaldım.
Mən yenə ehtiyac
İçində qaldım.
Hələ ümid varmı
yenə gözləyim,
Elə ömür varmı ölümsüz olsun?!
İstədim xalqıma
elə söz deyim,
Xalqımın qəlbindən
gələn söz olsun.
Sabah vidalaşdım
özüm bəlkə də –
Qoy eşqim çağlasın
şəlalə kimi.
Bitib-tükənməmiş
sözüm bəlkə də,

Bitəcək torpaqdan bir lalə kimi!
Qoy onda cahana
Yenə göz açım,
Bəlkə bir laləymiş
Son ehtiyacım?!

*1983*

## NƏ KİÇİK GÖRÜNÜR DAĞLAR UZAQDAN

Nə kiçik görünür dağlar uzaqdan,
Baxırsan könlündə min xəyal olur.
Bir ovuc görünür bağlar uzaqdan,
Dağ boyda palıdlar qara xal olur.

Dayanıb baxdıqca elə gəlir, sən
Əlini uzatsan çatar zirvəyə.
Bu xəyal içində yaxın gəlirsən,
Dağlar uzaqlaşır, yüksəlir göyə.

Görürsən: ucadır dağların başı,
Onun sıldırımı, yarğanı vardır.
Parlaq ulduzlardan ipək balışı,
Qalın dumanlardan yorğanı vardır.

Bəzənib, yenə də nurla çöl-bayır,
Yenə çiçək açır dağlar, çəmənlər.
Bəli, həqiqətə yaxın olmayır,
Bəzən uzağı da yaxın görənlər!

*1956*

## DÜNYAYA GÜNƏŞTƏK NUR YAYAN İNSAN

Dünyaya
Günəştək
nur yayan insan,
Vaxt olur
Üfüqdə
ulduztək axır.
İlləri min-dostla
adlayan insan,
Ölümlə döyüşə
təkbətək çıxır.
Bu gözlə görünməz
sirli döyüşdü –
İnsan bu döyüşü harda görmüşdü?
İnsan da,
Ölüm də
baxdı, gülüşdü...
Gülüşdən
Ürəyə
bir şübhə düşdü.
– Ölüm, bəlkə ölmək
dəhşət deyildir.
Gəlmişik... gedirik...
bu ki, bir haqdır.
Torpağa gömülmək
dəhşət deyildir.
Dəhşət diri-diri
ölü olmaqdır!
Elə ki, can aldın,
Məgər ucaldın?
Yeridin şaxtayla,
əsdin küləklə...
Ölüm, elə bildin
qələbə çaldın,

Ölüm, öləcəksən
            ölümsüzlüklə!..
...Yox! Necə? Ölüm də
            ölə bilərmi?
Bəlkə bir üşütmə
            düşdü canına?..
Nəsə fikirləşdi
            o qəmli-qəmli,
Əyri qılıncını
            qoydu qınına!

*1981*

## ŞEİR HƏSRƏTİ

Misralar üstündə düşündüm bəzən,
Qəlbin dediyinə qulaq da asdım.
Ən gözəl şerimi yazmasam da mən,
Sandım ki, sonuncu şerimi yazdım.

Elə boşaldı ki, sinəmdə ürək.
Dedim, bir də yəqin yazmayacağam.
İlham gəlməyəcək yenə qonaqtək,
Bəlkə də saralmış, solmuş bir dağam.

Günlər həyacanla ötüşdü bir-bir,
Yatmadım bəzən də səhərə qədər.
Yaşayır sonuncu şeirlə şair,
Başqa bir sonuncu əsərə qədər.

Yenə dilə gəlir ürək telləri,
Quş kimi uçmağa hazıram yenə.
Elə yazıram ki, sonuncu şeri,
Sanki ilk şerimi yazıram yenə.

*1959*

## ON YEDDİ YAŞIN NƏĞMƏSİ

(*Arzunun öz anasıyla xəyalı söhbəti*)

– Dəniz olmaq
istəyirəm
ay ana,
Öz sinəmi göylər üçün açaram.
– Yox, ay bala,
anan qurban boyuna,
Dəniz olsan, necə səni qucaram?
– Zirvə olmaq
istəyirəm,
ay ana,
Ucalardan hər an səni araram.
– Yox, ay bala,
anan qurban boyuna!
Necə onda saçlarını dararam?
– Günəş olmaq
istəyirəm,
ay ana,
İşıq alsın məndən torpaq, asiman..,
– Yox, ay bala,
anan qurban boyuna!
İşıq verib sən özün də yanarsan!
– Bulaq olmaq
istəyirəm,
ay ana,
Dağdan axım bağçaya mən, bağa mən...
– Yox, ay bala,
anan qurban boyuna!
Özün dağsan,
sığarmısan
dağa sən?
– Nəğmə olmaq
istəyirəm,
ay ana,

Mən səslənim, batma dərdə, qəmə sən!
– Ol, ay bala,
                    anan qurban boyuna!
Sən onsuz da
                    mənə sonsuz nəğməsən.

*1979*

## REYHAN ƏTİRLİ DÜNYA

Baxdım gözlər qəmli,
Baxışlar ürkək,
Mən susdum, qurudu dilim də sanki.
Bir əldən tutdum ki,
Atəşli, titrək,
Reyhan topasıydı əlimdə sanki,

Birdən ulduzlar da
yerə endilər,
Şimşəklər hay verdi ürək ahıma.
Sanki şəfəqlər də ətirləndilər,
Reyhan rahiyəsi axdı ruhuma.

Sözlər çəmənlərdən
Əsən yel kimi,
Tanrı, sözlərin də ətri olarmış!
Gözlər lalədəki qara xal kimi,
Tanrı, Gözlərin də ətri olarmış!

Zülmətli yollardan
keçirdim dünən,
Bu günsə parladı ziya mənimçin.
Özüm də bilmirəm nə üçün, nədən,
Reyhan ətirlidir dünya mənimçin.

Könüldə oyanan
Bu duyğu nəydi?
Yapış əllərimdən ey sirli əllər!
Bəlkə ilahidən bir möcüzəydi,
Ətirli dünyamda ətirli əllər?

Küləkdir,
Çiçəklər leysan qoparır,
Görən axtarıram mən kimi, nəyi?

Məni, mən bilmirəm hara aparır
Heyran ürəyimin reyhan istəyi?

Bu mənə cahanda
                    Sirr kimi qalır,
Sən kimin arzusu, məhəbbətisən?
Bəlkə həqiqətin
                    sən ilk xəyalı,
Xəyalın sonuncu həqiqətisən?

*28–31 dekabr 1997*

## GECDİR

Qocalan sifətdir,
                    yoxsa ürəkdir?
Ani şimşək kimi çaxmaq da gecdir.
Cavanlıq geriyə dönməyəcəkdir,
Büllur güzgülərə baxmaq da gecdir.

Çaylar xəyal olub,
                    hara axdılar?
Yuyunmaq dum-duru bulaqda gecdir.
Əfsus qədim dostlar dönük çıxdılar,
Təzə dost axtarıb tapmaq da gecdir.

Məhəbbət əzizdir,
                    sevda müqəddəs
Duyğular oyatmaq ürəkdə gecdir!
İndi sevilməkdən söz düşə bilməz,
Daha yer üzündə sevmək də gecdir!

İnsanlar insandan
                    var-dövlət umur,
Sənə var-dövlət də qazanmaq gecdir,
Şerə, sənətə də cahan göz yumur,
Şeirlə sərvət də qazanmaq geçdir!

Ürək arzularla
                    döyünmək istər,
Bəlkə ümid-deyə sələmək gecdir?
Tanrı, gec deyilsə möcüzə göstər!
Yoxsa möcüzə də gözləmək gecdir?
Gecdir?
          Möcüzəsiz dünya da heçdir!

*Yanvar 1997*

## MARAL

Qalın meşəlikdən talaya çıxdın,
Durub ürkək-ürkək dörd yana baxdın,
Bəlkə düz üstümə yollanacaqdın,
Məni görməsəydin əgər sən, maral?
Bəs niyə boynunu əyirsən, maral?

Gör necə qaradır, qara gözlərin,
Vurub neçə qəlbə yara gözlərin.
De, belə zillənib hara gözlərin?
Niyə məlul-məlul baxırsan, maral?
Könlümü yandırıb-yaxırsan, maral?

De, hansı dərədən, düzdən keçmisən?
Özünə haranı oylaq seçmisən?
Hansı bulaqlardan, de, su içmisən?
Keçdiyin yerlərdən keçəydim, maral!
İçdiyin sulardan içəydim, maral!

Qaçma, pöhrəlikdən üzə çıx, dayan,
Çökər gözlərimə qaranlıq, dayan.
Barı, heç olmasa bir anlıq, dayan,
Qoy baxım doyunca sənə, ay maral!
Tələsmə, gedərsən yenə, ay maral!

Qoysan, lap yanına gələrəm sənin,
Oxşayıb qədrini bilərəm sənin.
Gözlərin yaşarsa silərəm sənin,
Nədir üzündəki sual, ay maral?
Mən ovçu deyiləm, maral, ay maral!

*1956*

## DAĞ VƏ DƏNİZ

Axşam...
Göy fikirli...
Dəniz nigaran...
Bəs orda,
Dağlarda
Necədir axşam?
Mən baxan dağlara,
Ay mənsiz baxan,
Sən baxan dənizə sənsiz baxıram.

Fikirlər əriyir
Dumanlar kimi,
Səsim sahillərdən zirvəyə çatır,
Orda çaylar axır ümmanlar kimi,
Burdasa dalğalar dağlar boydadır.

O yerdə çırpınır qəlbim haçaqdır,
Səslənir dağların ağ zirvəsindən.
Demə ki, dağlardan dəniz uzaqdır,
Dəniz ki, başlanır dağ zirvəsindən.
Dəniz dalğalanar hər səhər-axşam,
Qarı əridikcə uca zirvənin.
Əgər sən dağsansa, mən də ümmanam,
İlk damlam zirvəndən
Başlanır sənin.

*1968*

## GƏLƏRMİ, GƏLMƏZMİ?

Yad edib o məni,
Gələrmi, gəlməzmi?
Qəlbimdən keçəni
Bilərmi,bilməzmi?

Baxışı səmimi,
Kipriyi sinəmi
Bir zərif ox kimi,
Dələrmi, dəlməzmi?

Mən susmaz bir səsəm,
Yel olub tələssəm,
"Sevirəm" söyləsəm,
Gülərmi, gülməzmi?

Mənimlə dərdimi
Bölərmi, bölməzmi?
Gözdə yaş gördümü,
Silərmi, silməzmi?
Gələrmi,
Gəlməzmi?

*1993*

## QOCA VƏ CAVAN

O səs, əsrlərdən gəlir elə bil.
O səs, necə uzaq, necə də kövrək.
Əsir o qocanın ürəyi tel-tel,
Cavansa dinləyir gülümsəyərək.

Birinin çiynində bir əsrin yükü,
Qalıb əl çatmayan dünəndə həyat.
Biri saya almır-heç yeri, göyü
Əmrilə dövr edir sanki kainat!

Biri salamlayır Günəşi, Ayı,
Birinin gözündə sönən bir çıraq.
...Qoca elə bilir cavan olmayıb,
Cavan elə bilir qocalmayacaq!

*1984*

## ÇİNARLI MƏZAR

*Əli Kərimə*

Üzlərə qonubdur
Bir qərib təbəssüm,
Gözlərdə donubdur
Bir qərib təbəssüm.
Qəlbimdə bir haylı,
Haraylı
Sükut var.
Çağıran,
hayqıran
Bir ayrı sükut var.
Üstü daş düzülü
Bir məzar görürəm,
Dostlardan küsülü
Bir məzar görürəm.
A torpaq, qoynunda
Uyuyan o kimdir?
O məzar, çinarsız,
Deyərdim yetimdir,
Laylatək səslənər
Çinarlar, çinarlar,

Əziz bir körpəni
Anarlar çinarlar.
– Tez gedib, tez gəldin –
Deyərlər çinarlar!
Anatək ona baş
əyərlər çinarlar!
...Bir dinən ürəkdir
o əsən küləklər,
hardansa harasa
Tələsən küləklər.
Hardasa bir gəlin

Üç övlad böyüdür,
Elə bil üç sirli
Kainat böyüdür.
Könlümdə payız tək
Dumanlı sükut var,
Yerdə də, göydə də
Tufanlı sükut var.
...Qəlbimdə bir Əli
nisgili
yaşayır,
Qəlbimdə bir Əli
Heykəli
Yaşayır!...

*1969*

## DƏRƏLƏR

Çinarlar qatar-qatar,
Qalxıb zirvəyə çatar...
Dağa qısılıb yatar
Mışıl-mışıl dərələr,
Yaşıl-yaşıl dərələr.

Sizlərə vurğunam mən,
Bəzəyiniz şəfəqdən...
Günəş çıxar üfüqdən
Ovuc-ovuc zər ələr,
Dərələr!..

Sevdiyiniz ağaclar
Küknarmıdır, şammıdır?!
Sizdən qalxan dumanlar
Dağlara salammıdır?!

Quş kimi üstünüzdən,
Qanad çalım dərələr!
Şamlıqda bir axşamlıq,
Qonaq qalım, dərələr!

Əgər ki, yıxılsam çinar göstərin,
Mən ona söykənib arana baxım.
Gözlərim görməsə Göy gölü verin,
Mən onun özüylə cahana baxım.
Hər yerdə, həmişə
Sənsən gümanım.
Canım-gözüm mənim!
Azərbaycanım!

Sən günəş, mən isə bir zərrə kimi
Diriykən oğlunam,
Ölsəm torpağın.

Sən ki, döyündürdün mənim qəlbimi,
Sən uca çinarsan, mənsə yarpağın,
Mənəm sənin özün,
Ey eşqim, canım,
Sənsən özüm mənim,
Azərbaycanım!

Sizlərdən yollar keçər,
Siz yaxşı ki, varsınız,
Dərələr!
Zirvələrə açılan
Geniş qapılarsınız,
Dərələr!

*1965*

## ŞƏHRİYAR ÜÇÜN

*Qardaşım Nəbiyə deyin: Xəzərdən*
*çoxdandır xəzriylə əsməyir nədən?*
***(Cənub ərməğanından)***

Əriyir Kəpəzdə,
Savalanda qar,
Sular dərələri oyadıb gəlir.
Payızda cənuba
gedən durnalar,
Novruzda təzədən qayıdıb gəlir.
Gəlir, yerə, göyə ilham gətirir,
Vətəndən vətənə salam gətirir.
Yurdun səhərində
gözüm var mənim,
Zümrüd çəmənlərdə ot dizəcəndir.
Hər iki sahilli
düzüm var mənim,
Mənim astanamdan Təbrizəcəndir.
Çiçəklər bu yerin mehribanıdır,
Vətənin vətənə ərməğanıdır.

Araza baxaram,
gözlərim dolar,
Mən işıq umaram, şəfəqlər sönər.
Burda ləpələnib
qaynayan sular
Çatıb o sahildə dalğaya dönər.
O, mənim sevgimin gur dalğasıdır,
Vətənin vətənə nur dalğasıdır.
Küləklər, bir sirli
Həyat kimisiz,
Axı, orda gözlər ürəklər məni
Küləklər açılan
Qanad kimi siz,
O yerə aparın, küləklər, məni.
Küləklər – ürəklər nidası kimi,
Vətənin vətənə sədası kimi.

## KİM MƏNİ XATIRLASA

Kim məni xatırlasa,
Çıxaraq sahillərə,
Mavi Xəzərə baxsın.
Çevrilərək min kərə,
Göy ləpələrə baxsın.
Bilsin, Xəzər mənimdir,
Göy ləpələr mənimdir,
Kim məni xatırlasa.

Kim məni xatırlasa,
Gəlsin bulaq başına,
Qoşa çinarı görsün.
Dolanıb dağ başına,
Qalxan yolları görsün.
Coşsun bulaqlar kimi,
Dayansın dağlar kimi,
Kim məni xatırlasa.

Kim məni xatırlasa,
Əyilib səhər çağı
Kürdən, Arazdan içsin.
Bəzənəndə Şahdağı
Dərədən asta keçsin.
Zirvə buludlardadır,
Bilsin, qəlbim ordadır,
Kim məni xatırlasa.

Kim məni xatırlasa,
Çobanla dağ başında
Bardaş qurub otursun.
Qayaların qaşında,
Bəzən kəklik də vursun.
Zəhmətə alqış desin,
Günəşə gülümsəsin,
Kim məni xatırlasa.

Kim məni xatırlasa,
Bilsin ki, qəlbim vurur.
Hələ min diləyim var,
Burda keçmişim durur,
Burda gələcəyim var.
Gəzsin Mili, Muğanı,
Bütün Azərbaycanı,
Kim məni xatırlasa.

*1959*

## AĞ ÇİÇƏK

Səhər çağı, göy meşədən
dərdik səni, ağ çiçək.
Bəyaz-bəyaz varaqlara,
Sərdik səni, ağ çiçək!
Birdən-birə ağ əllərdə
təzələşdin, ağ çiçək.
Ağ əllərdə
Elə bil ki,
ağ atəşdin, ağ çiçək.
Gördüm səni
Bu gün başqa
bir çəməndə, ağ çiçək.
Ağ əllərin
Hərarəti
yoxmu səndə, ağ çiçək?
Soyuq-soyuq
Boylanırsan,
söylə, neçin, ağ çiçək?
De, səndəmi
Həsrətlisən
ağ əllərçin, ağ çiçək?!

*1967*

## SƏN DOĞULAN GÜN

Göz açdı dünyaya səssiz-səmirsiz,
Sən doğulan gün.
Mənimçin doğuldun məndən xəbərsiz,
Sən doğulan gün.

Yaşayır ömrümün baharı kimi,
Sən doğulan gün.
İllərin sapında mirvari kimi,
Sən doğulan gün.

Həyatın gözəllik təmənnasıdır,
Sən doğulan gün.
Sevgi ümmanının ilk damlasıdır,
Sən doğulan gün.

İllər üzüyünün qaşı sayılsın,
Sən doğulan gün.
Dünyanın məhəbbət yaşı sayılsın,
Sən doğulan gün.

*1967*

## BƏZƏN

Bəzən zirvədəki
                    bulud kimiyəm,
İndicə düzlərə
                    enəcəyəm mən.
Bəzən dərədəki
                    sükut kimiyəm,
İndicə tufana
                    dönəcəyəm mən.
Bəzən dənizdəki bir damlayam da,
Tufandan qüdrətli bir dalğayam da.
Bəzən dağdan axan
                    şəlaləyəm mən!
Torpaqdan bitməmiş
                    bir laləyəm mən.
Bəzən qoca qışam,
                    cavanca yazam,
Qaram, damlalarım
                    selə çatmayıb.
Bəzən milyon ildən
                    yanan ulduzam,
İşığım torpağa
                    hələ çatmayıb.

*1955*

## SEVGİ VADİLƏRİNDƏ

İnsanlar ümid – deyə
birdən çıxır üz-üzə,
Sevgi vadilərində.
Ömrə zülmət də çökür –
can atarkən gündüzə,
Sevgi vadilərində.
Çəmən içir günəşi
qanlı piyalələrlə,
Qayalardır ağlayan
büllur şəlalələrlə,
Sevgi vadilərində.
Əlvan-əlvan nur saçan
ətirli güllər bitir,
Bal çiçəklər içində
zəhərli güllər bitir.
Sevgi vadilərində.
Həqiqətlə yanaşı
səslənir ağ yalan da,
Çıxır sənin qarşına
haça dilli ilan da.
Sevgi vadilərində.
Dərdli-dərdli iz salır,
müqəddəs yola insan,
Vüsala yetməsə də
yetir kamala insan,
Sevgi vadilərində.
Sehirli yol necə də
sevimli möcüzədir,
Sonu sonsuz mavilik,
sonu uca zirvədir,
Sevgi vadilərində.

*15-22 may 1994*

## MAVİDİR...

Bu gün heç bilmirəm
Nə üçün, nədən,
Səma da mavidir,
Torpaq da mavi.
Görürəm dünyanı başqa rəngdə mən,
Ağac da mavidir,
Yarpaq da mavi.

Əsir haradansa sərin küləklər,
Dağdan mavi-mavi duman sürünür.
Mavi kəpənəklər, mavi çiçəklər,
Mavi çəmənlər də qəşəng görünür.

Sulara yel dəyir, sular titrəyir,
Yerin də mənimtək böyük sirri var.
Sanki əfsanəvi nəğmələr deyir
Mavi sahillərə mavi dalğalar.

Rəngi bambaşqadır çölün, düzün də,
Mavi şəfəqlərdir çilənən yerə.
Uçur göy üzündə bu mavi gündə,
Mavi təyyarələr maviliklərə.
Mən bəlkə bilirəm
Nə üçün, nədən,
Dünyanın gündüzü maviləşibdir?
Bəlkə də sən mavi geyindiyindən
Yer üzü, göy üzü
Maviləşibdir.

Elə bil sənintək bəzənib aləm,
Səma da, torpaq da,
Sanki mavidir!
Bəlkə xoşbəxtlərin xoşbəxti mənəm,
Bəlkə səadətin rəngi mavidir?

## TƏKCƏ ÜMİD QALSIN

İstəsən
sükuta bürünsün cahan.
heç nə yox,
al məndən gülüşlərini...
Al məndən ömrümlə
əbədi qalan
o ani,
o ani
Görüşlərini.

İstəsən, qoy olsun!
Nə danış, nə din!
Al indi o əziz günləri məndən,
İstəsən, bir sabah mənə verdiyin
Sədaqət andını
al geri, məndən!

İstəsən, al məndən
düşəndə kölgə,
Yaşıl meşələrin pıçıltısını.
Bizimçin darıxan
sahillə birgə,
Al məndən dənizin parıltısını.

Fəqət soyuq baxma,
sən gendən, gözəl!
Sənsiz
günəşsizdir
Bu göy, bu torpaq,
hər şeyi,
hər şeyi,
Al məndən, gözəl!
Təkcə ümid qalsın
  qoy məndə ancaq.

Ümid –
   bir dünyalıq sükut içində
Bir dünyaya dəyən
gülüşlərindir.
Ümid –
   bir şimşəkdir
   bulud içində,
O ani,
əbədi
görüşlərindir.

*1967*

## YADLAR DOST OLANDA

Uca zirvə
Vüqarlanar
ağ buluduyla,
Ağ buludlar
Ağ zirvəyə
ağ qanad olar.
İnsanlarsa
Qanadlanar
ürək oduyla.
Sədaqətlə
Əkiz qardaş
etimad olar.
Dostlar bizə
Qılınc çəksə
lal sükutuyla,
Varlığımız
Haray çəkən
bir fəryad olar.
Yadlar gəlib
Dost olanda
Dostlar yad olar!

*1976*

## SAKİT SƏTİRLƏR

İnsanlar sevilər,
Sevər dünyada,
Ümidlər ömürçün məğrur qanaddır.
Sevgi bir kiçicik
Qəlbə sığsa da,
Bəlkə sevgi özü bir kainatdır.

Onun üfüqləri
O qədər dərin,
Onun arzuları könül varıdır,
Bəlkə o şəfəqli, nurlu gözlərin
həmin kainatın
Ulduzlarıdır.

Ürəyə bağlanan
Cığırda, izdə,
Tapar ahəngini ömrün iqlimi.
hər təzə duyğunu
Öz qəlbimizdə,
Açırıq təzə bir planet kimi,

Keçərik ümidlə
Yol aça-aça,
Gözlərik ən nurlu
Sabahımızı.
Dünyanın məhəbbət sarayındaca,
Tale özü kəsib nikahımızı...

Alar qucağına
Bahar-yaz məni,
Məni sənin eşqin
Qanadlandırar.
Tropik isti də yandırmaz məni,
Sənin
Soyuqluğun
Məni yandırır.

* * *

Arzumuz doğulur
Aydın səhərlə,
Oxşarı çağlayan çaylarla olur.
Bizim görüşümüz
Dəqiqələrlə,
Bizim ayrılıqsa aylarla olur.

Sən günəş,
Mən isə başı qarlı dağ,
Sınır şimşəklərdən
Göy çilik-çilik.
Biz ki, bir-birindən
Uzaq da olsaq,
Biz ki, bir-birindən
Ayrı deyilik.

* * *

Görüşdük,
Dalğalar axdı sahilə...
Dinlədin,
Danışdım aram-aram mən.
Dedim ki, xoşbəxtəm,
Çünki səninlə
Eyni bir küçədən addımlaram mən.

İl keçdi,
Dalğalar dəydi sahilə...
Hər sənsiz günümü il sayıram mən.
Deyirəm: xoşbəxtəm,
Çünki səninlə
Eyni şəhərdəcə yaşayıram mən.
İl keçər...
Dalğalar vurar sahilə...
Sanaram eşqinlə uçan quşam mən.
Deyərəm xoşbəxtəm,
Çünki səninlə
Eyni planetdə doğulmuşam mən.

*1967*

# BURA MUĞANDIR

*Ə.Kürçaylıya ithaf*

Çəmənlər yamyaşıl, dərələr gözəl,
Elə bil dünyada hər yerdən əvvəl,
Səhər bura gəlir əlində məşəl,
Bura zülmət boğan, günəş doğandır,
Bura Muğandır!

Zəhmətlə yoğrulmuş onun mayası,
Min əsrin eşqidir sözü, mənası.
Ağ-ağ tayalardır dağı, qayası,
Sonsuz zəmiləri dərin ümmandır,
Bura Muğandır!

Onun ilk arzusu, muradı Kürdür,
O, bir qartaldırsa, qanadı Kürdür.
Onun anası Kür, övladı Kürdür.
O, həm qəzəblidir, həm mehribandır,
Bura Muğandır!

Doğur qış səhəri, susur çöl-bayır,
Baharın özü də burda qışlayır...
Dünyanın quşları onu xoşlayır,
Min eldən gələnə bir aşiyandır,
Bura Muğandır!

Burda coşğun keçən hər insan ömrü,
Andırır Xəzərə tökülən Kürü.
Obaşdan düzlərə yayılan sürü,
Elə bil dağlara qalxan dumandır,
Bura Muğandır!

Yağdıqca düzlərə nur qucaq-qucaq,
O gözü dumanlı ceyrana bir bax,
Hansı şairisə xatırlayaraq:

"Məni bir də yazın..." deyir haçandır.
Bura Muğandır!

Həyat ona verib bütün rəngini,
Söyüdlü çayların ilk ahəngini.
Çəmənin sonsuzu, göyün əngini,
Ona təbiətdən bir ərməğandır,
Bura Muğandır!

Xoş olar ürəyin ümmanı varsa,
Sevinci, kədəri duyanı varsa...
Kimin Muğan boyda Muğanı varsa,
Desin ki, səhra yox, o bir cahandır,
Adı Muğandır!

*1959*

# NAR-NAR

(*Lənkəran mahnılarından*)

Gül-çiçəyi dərərəm, nar-nar,
Əlvan çələng hörərəm, nar-nar.
Hər gün səni görəndə, nar-nar,
Öz bəxtimi görərəm, nar-nar,

Dağlara gün düşəydi, nar-nar,
Demə, neyçin düşəydi, nar-nar.
Bizim evin yanından, nar-nar,
Yolun hər gün düşəydi, nar-nar,

Qanadlanıb uçaydım, nar-nar
Qəmdən uzaq qaçaydım, nar-nar.
Ürəyimi bir axşam, nar-nar,
Sevdiyimə açaydım, nar-nar,

Buz bulaqdan içəydik, nar-nar,
Dostu yaddan seçəydik, nar-nar.
Barı bizim küçədən, nar-nar,
Bir gün qoşa keçəydik, nar-nar.

*1957*

## KÜLƏK

Yenə payız gəldi qonaqlar kimi,
Soldu məhəbbətim yarpaqlar kimi,
Ürək pıçıldayır dodaqlar kimi,
Külək, niyə belə əsirsən, külək?
Niyə ümidimi kəsirsən külək?

Sevgilim görüşə çağırmış məni,
Mən necə unudum olub-keçəni?
O deyir astaca: "Sevmirəm səni..."
Sən niyə sözünü kəsirsən, külək?
Külək, niyə belə əsirsən, külək?

O ürək ağrıtdı, ürək incitdi,
Bir eşqin sevimli nəğməsi bitdi.
Sanki məhəbbətim xəyaldı, getdi...
Külək, niyə belə əsirsən, külək?
Səndəmi sevgimi gəzirsən, külək?

*1959*

## NAR AĞACI

Yenə qumlu sahil, yenə sərin bağ,
Yenə axşam düşüb meynəliklərə.
Burda sevgililmlə neçə il qabaq,
Bir nar çubuğunu basdırdıq yerə.

Nar ağacı, nar çiçəyi,
Bir ülduzdu hər çiçəyi.

Seyr etdim ağacın doğma yerini,
Bircə çiçək qalıb, hanı çiçəklər?
Onun qızıl rəngli ləçəklərini,
Ya illər tökmüşdür, ya da küləklər.

Nar ağacı, nar çiçəyi,
Döyüb tufan, qar çiçəyi.

Baxıram, qəlbimdə arzu oyanır,
Uzaq xəyallarım alır qəlbimi.
Sanki ay nurunda ulduzdur yanır,
O son nar çiçəyi ilk eşqim kimi.

Nar ağacı, nar çiçəyi,
Hələ yenə var çiçəyi.

*1959*

## PƏNCƏRƏMİ DÖYÜR ÇİNAR

Qışdır... Yağır bayırda qar...
Ağ geyinib dərə, düzən.
Pəncərəmi döyür çinar,
Deyir çinar:
– Burax gəlim qızınım mən!

Yaydır... Evdə bir isti var,
Bir isti var,
Gəl görəsən!
Pəncərəmi döyür çinar,
Deyir çinar:
– Çıx, sərinlən kölgəmdə sən!..

*1962*

## TUFANLAR ÇAĞIRIR

Buruqlar göz qırpır dənizdə tək-tək,
Xəzərə bağlıdır qəlbin haçandır.
Bahardır, hər tərəf yenə gül-çiçək,
Baharda ayrılmaq daha yamandır,
Saxlaya bilmərəm axı, mən səni,
Qəlbinin özüdür səsləyən səni.

Şütüyür ləpələr qanadında nur,
Bir sükut içində yatır bağça-bağ.
Ürəyim eşidir, ürəyim duyur,
Dənizin qoynunda tufan olacaq.
Saxlaya bilmərəm axı, mən səni,
Xəzərin özüdür səsləyən səni.

Dəniz də baş əyir qəhrəmanlara,
Mənim ürəyim də səninlə gedir.
Tufanlar qoynunda boy atanlara,
Tufansız yaşamaq ölüm kimidir.
Saxlaya bilmərəm axı, mən səni,
Tufanın özüdür səsləyən səni.

*1959*

## ŞAHİD

Onlar görüşdülər... Aylı gecəydi...
Oğlan pıçıldayır: "Sevirəm – dedi,
– Əhdindən dönənin gözü oyulsun!
Ay da sevgimizə qoy şahid olsun.

Onlar ayrıldılar... Aylı gecəydi...
Oğlan başqasına: "Sevirəm" – dedi.
Ay girdi buluda üzündə kədər,
Qorxdu, bir də onu şahid çəkərlər.

*1961*

## DƏNİZ LÖVHƏSİ

Su mavi...
Göy mavi...
Hava da səssiz...
Gəmi maviliyə ağ inci düzür.
Üfüqlə o qədər qovuşub dəniz
Gəmi sanırsan ki, göylərdə üzür.

*1962*

## YAZ GÜNÜ – NOVRUZ GÜNÜ

Bu gün, yaşıd olur gündüzlə gecə,
Dağa duman çöküb, çən yeridikcə,
Dərin dərələrdə sel daşan gündür.
Uca zirvələrdə
Qar əridikcə,
Damlalar dəryaya qarışan gündür.
Bu gün yerin, göyün öz sevinci var,
Gözünü açdıqca günəşli bahar,
Gözlər şəfəqlərdən qamaşan gündür,
Uzaq üfüqdəki soyuq ulduzlar
Bu gün isti-isti sayrışan gündür.

Gəlin, salamlayaq doğma baharı.
Ana yurdumuzun
Ana qolları.
Baharın boynuna sarışan gündür.
Odlar torpağının gur tonqalları
Yerin ürəyitək alışan gündür.

Çaylar arzu kimi aşıb-daşanda,
Həsrətli torpaqla yaz qovuşanda,
Yer göyə,
Göy yerə
Yaraşan gündür.
Təbiət sevgidən söhbət açanda,
Küsmüş sevgililər barışan gündür.
Durnalar vətənə dönür qürbətdən,
Üfüqlərin donu mavi xələtdən,
Köksündə günəşi
Zər nişan gündür.
Bu gündən, sabahdan, əbədiyyətdən
Mehriban-mehriban danışan gündür.

*1967*

## O GÜNDƏN

Seyr elə,
Sirlidir
dağlar bu gün də.
Dağlarda bir qara
mağara durur.
Yazda da, qışda da
onun üstündə,
Buludlar ağara-ağara durur.
Sən keçib zamanın
sərt gərdişindən,
Göz açdın bəşərin
oğlan yaşında.
Bir ana qəlbinin
odlu eşqindən,
Doğuldun bir yanar
tonqal başında.
Toxundu ilk dəfə
gözlərə odlar,
Sanki çiçək səpdi
üzlərə odlar.
Sirli nida gəldi
göy qatlarından,
Ayın şəfəqində yudular səni.
Zümrüd çəmənlərin
göy otlarından,
Bir yumşaq bələyə
tutdular səni.
Yerdə qığılcımlar,
göydə ulduzlar,
Sanki bir-birinə
dəydi ulduzlar.
Əmdi tər dodaqlar
ana döşündən,
Bəyaz süd selləri axdı cahanda.

Öz həyat səsinlə
qışqıranda sən,
Yuxudan gecənin
özü oyandı.
Sənə layla dedi
mehriban ana.
Gözündə şəfəqi
atəşin, odun.
Gəlib keşməkeşli
dünya qoynuna,
O gecə odlarla
qoşa uyudun.
Düşdü qayalara
bir qara kölgə,
Sənin başın üstdə
ildırım çaxdı.
O gündən qəlbində
al qanla birgə,
Alovlar çağladı,
atəşlər axdı.
Parlayıb atəşli
ehtiras kimi,
Alovlu tufanlar
qoparan oldun.
O gündən atəşi
bir miras kimi
Əsrdən əsrə
aparan oldun.

*1987–1988*

## SƏN ƏGƏR Kİ...

Sən əgər ki, tər tökməyib
əkin əkdin,
Əkin sənin deyildir.
Sən ilhamsız fırça alıb
şəkil çəkdin,
Şəkil sənin deyildir.
Sısqa çay tək sən ümmana
axar olsan,
Ümman sənin deyildir.
Sən cahana soyuq qəlblə
baxar olsan,
Cahan sənin deyildir.
Yer üzündən ikiəlli
sən yapışma,
Dünya sənin deyildir.
Gölə uçub, sona qonsa
atəş açma,
Sona sənin deyildir.
Heyrətlənmə qabağına
səhra gəlsə,
Səhra sənin deyildir.
Şeir yazsan, birdən asan
misra gəlsə
Misra sənin deyildir.

*22 dekabr 1989*

## QARA GÖZ YAŞLARI

Nə tez vida dedik biz Ələkbərə,
Dörd il elə bil ki, bir anlıq şimşək,
Rəssama yalvardım, qara mərmərə
Oğlumun şəklini təbəssümlü çək.
Elə bil mərmərdə ağ çiçək açdı,
Sanki işıqlandı qapqara mərmər.
Təbəssümü yerə, göyə yaraşdı,
Anası yanına köçənə qədər.
Yollar sükunətin getdi qoynuna,
Günəşin şəfəqi qıyqacı düşdü.
Anası uzandı oğul yanına,
Bir gör həsrətlilər, harda görüşdü.
Qəbir daşlarından yer kölgələndi,
Təbəssüm yox idi üzündə onun.
Oğul gözlərində yaş gilələndi,
Qara göz yaşıydı gözündə onun.
Dünyanın belə bir sirri də varmış,
Torpaq altında da insan ağlarmış.
Yaşlar işıq saçır, nurlu səhərdə,
Ayın şəfəqində parlayır gecə.
İki qara büllur durub gözlərdə,
Titrəşir, düşəcək sanki indicə.
Həyatdır! Günləri aylar udurdu,
Yaşlar titrək-titrək elə dururdu.
Burda ürək susur, necə danışım,
Ey mənim dörd yaşlım, gözləri yaşlım!
Nə dərddi başıma cahanda gəldi.
Yenə tüğyan edir ömrün qışları,
Niyə yerin-göyün ürəyi soyuq?
Anan yanındadır, sən rahat uyu,
Bəlkə tezlik ilə atan da gəldi.
Tök qara torpağa qara yaşları!

*28 noyabr 1989*

## DƏRDSİZ ADAM AXTARMAYIN

Tanrı,
                    dərd çəkməyə
                              səbr, dözüm ver,
Həyatın yolları qışdır, borandır.
Dərdlilər dünyada yarımpeyğəmbər,
Dərdsizlər dünyada yarıminsandır.
Zəka məskənidir kiçik çadır da,
Fikirlər zülmətdə günəşdir, aydır,
Dərd ancaq öldürmür, dərd ucaldır da,
Müdriklik olmazdı dərd olmasaydı.
Yeknəsək bir ömrün mənası varmı?
Sən ey rahat
                    həyat,
                              yolumdan çəkil!
Əbədi xoşbaxtlar dərdi duyarmı?
Əbədi xoşbaxtlıq bədbəxtlik deyil?
Deyim kədərimin qətiyyətilə,
Dərdsizlərin dərdi daha böyükdür.
Onlar ki, öz yüngül xasiyyətilə,
Bütün yer üzünə ağır bir yükdür.
Tanrı,
                    dərd çəkməyə
                              səbr, dözüm ver,
həyatın yolları qışdır, borandır.
Dərdlilər dünyada yarımpeyğəmbər,
Dərdsizlər dünyada yarıminsandır.

*12 noyabr 1989*

## EYNƏK

Çarpayı yanında, kitablar üstdə,
Gözləri gözləyən bir eynək durur.
Qanad tək açılan, büllur şüşədə,
Quruyub göz yaşı, bir xal tək durur.
Doludur yer üzü qəmlə, təlaşla,
Hələ deyilməmiş sözüm, ahım var,
O getdi dünyadan bir damla yaşla,
Bir umman yaş tökdü dostlar, qohumlar.
Günlərin gəl, həzin neyini dinlə,
Sözdə dərdimizə nə çoxdur şərik.
Baxırıq dünyaya sənin qəlbinlə,
Dünyaya gözünlə baxa bilmirik.
Dərdlər elə əyir qəddimi hərdən,
Sanki dağ zirvəsi uçur üstümə.
Eynəkdən,
            güzgüdən,
                        pəncərələrdən
Gözlər məlul-məlul baxır gözümə.
Osa uzaqlarda bir mələk kimi,
Zərli kəcavəni yel təki sürür.
Səma nəhəng, büllur bir eynək kimi –
Biz onu görmürük, o bizi görür.

*6 noyabr 1989*

## KİMSƏSİZ BİR ADA İSTƏYİRƏM MƏN

Həyatda möcüzə gözləyirəm mən,
Kimsəsiz bir ada istəyirəm mən.
Dərəsi yamyaşıl, dağı yamyaşıl,
Öyrəndim dilini torpağın, daşın.
Onsuz da hər addım ağır bəladır,
Orda dağ bilmərəm, qaya bilmərəm.
Axı, yer kürəsi özü adadır,
Mən onu kimsəsiz qoya bilmərəm.
Sirrini pıçıldar göy otlar mənə,
Bəyaz kəfən biçər buludlar mənə.
Quşun bir dili var, – sözü bəllidir.
Niyə insan oğlu iki dillidir?
Üstümdə heybətli qanad çalsa da,
Bayquşla dinərəm aram-aram mən.
İnsanla dil tapmaq çətin olsa da,
Orda ilanla da dil taparam mən.
Özüm oxuyaram, özüm oynaram,
Özümü nə qədər xoşbəxt sanaram.
Birdən şeir yazdım, kimə gərəkdir!?
Bəlkə səhər bülbül dinləyəcəkdir?
Birdən kimsə görsə, aman, xudaya,
Deyər "dəli" gəlib bizim adaya.
Şair yaşasa da öz aləmində,
Məyər dəli azdır söz aləmində?
Qoy ağlı itirim, azadlıq tapım,
Bəlkə xoşbaxtlığa açıldı qapım.
Şeir var, kitab var, demək varıq biz,
Hərəmiz bir cürə günahkarıq biz.
Qoy sonsuz dəryada coşsun dalğalar,
Beş gün azadlığa ixtiyarım var.
Fəqət görünməsin bir kabus kimi,
Üfüqdən tələsən xilaskar gəmi.

Zirehli qayalar evimdir mənim,
Dağlara sədaqət – sevgimdir mənim.
Vurduqca özümü ümmana, çaya,
Birdən bir ilahə çıxsa qarşıya?
...Dünya ilahəsi uçdu yuxu tək,
Ada ilahəsi nəyimə gərək!

5-26 *sentyabr 1989*

## QONŞUDA QIZ SEVƏNİN

Bir küçədə hər səhər
Qarşılaşır qız-oğlan.
Qonşular da bu zaman
Baxarlar oğrun-oğrun.

Heç sinədə bu qədər
Düyün olmaz, dağ olmaz.
Qonşuda qız sevənin
Ürəyində yağ olmaz!

Qovuşubdur bağ-bağa,
Eyvanlarsa üzbəüz.
Oğlan sözü, fikri düz,
Düşünər gecə-gündüz.
Amma ki, danışmağa
Dil olmaz, dodaq olmaz,
Qonşuda qız sevənin
Ürəyində yağ olmaz!

Səhər bağdan çıxar qız,
Tellərinə gül düzər,
Qonşusundan gen gəzər,
Ürək yaxar, can üzər.
Baxar oğlan qərarsız,
Heç damağı çağ olmaz.
Qonşuda qız sevənin
Ürəyində yağ olmaz!

O sarmaşıq, o eyvan,
Tez-tez dəyər gözünə.
Baxar qızın üzünə,
Deyər özü özünə:
Bu qədər yaxın olan
Bu qədər uzaq olmaz!
Qonşuda qız sevənin
Ürəyində yağ olmaz!

*1955*

## HANI?

Sınır kövrək-kövrək qanad dünyada,
Sanıram sonsuzdur həyat dünyada.
Sabaha yaşamaq
gümanı,
hanı?
Biz doyduq zövqündən haçan dağların?
Bizi ana kimi qucan dağların,
Hanı süd ətirli
dumanı,
hanı?
Çox dedik dünyanın
etibarından,
Keçdik nisgillərin ahu-zarından,
Dərdlərin sızlayan
kamanı,
hanı?
Xəzan yarpaqları düşür çiynimə,
Qocalıq donunu biçir əynimə,
Gəzirəm, illərin
limanı,
hanı?

*31 avqust 1989*

## İSTƏ

Öz məğrur eşqimdə təmənnasızam,
Bir damla istəsəm,
Bir ümman istə...

Mən ki, bir dünyalıq baharam, yazam,
Bircə gül istəsəm,
Gülüstan istə.
Mənə ulduz boyda işıq ver desəm,
Sən məndən
Günəşli asiman istə.

Haçan bir saatlıq görüş istəsəm,
Sən bütün ömrümü
Ərməğan istə.

*1966*

## İKİLİKDƏ

Gəl, bölək dünyanı ikilikdə biz,
Dərə mənə düşsün,
Dağı sən götür.
Qalsın yer üzündə qoşa izimiz,
Qara mənə düşsün,
Ağı sən götür.

İlin övladıyıq yazla qış kimi,
Fəsillər yaşasın yanaşı məndə.
Biz ki, bir yerdəyik gözlə qaş kimi,
Gözlər səndə qalsın,
Göz yaşı məndə.

Gündüzü, gecəni əziz saxlayaq,
Günəş sənə düşsün,
Ay mənə qalsın.
Coşqun sellər kimi birgə çağlayaq,
Dəniz sənin olsun,
Çay mənə qalsın.

Bizik bü dünyaya səninlə şərik,
Bizsiz nə qış gülər,
Nə də ki, bahar.
Həyatda hər şeyi bölə bilərik,
Amma bölünməyən
Bir sevgimiz var.

*1964*

## İLLƏR VƏ SAHİLLƏR

Bir sahil görürəm...
                    Elə sahil ki,
Üstündə illərin tufanlarıdır.
Sahillər dənizin sonu deyil ki,
Sahillər dənizin limanlarıdır.

Çağlayır, axışır dalğalar çin-çin,
Onu yer səsləyir, göy alqışlayır.
Burda qurtarırsa sahil mənimçin,
Bəlkə başqasıyçın burdan başlayır.

Hər ömrün ölçüsü dünyada ildir,
Həyat təbiətin şah əsəridir.
İllər ömürlərin sonu deyildir,
İllər ömürlərin sahilləridir.

*1964*

## AY ÜRƏK

Yaralar qövr edir təzədən, ürək!
Niyə könül verdin ona sən, ürək?
    Sevmədi o səni, sən niyə sevdin?
    Səni sevməyəni sən niyə sevdin?

Eşqinə mən qurban gedim, ay ürək,
Dedim, neçə dəfə dedim, ay ürək.
    Sevməyir o səni, niyə sevirsən?
    Səni sevməyəni niyə sevirsən?

Sözümə baxmadın, indi yan, ürək,
Yan, hey mənim kimi peşiman ürək.
    Sevmirdi o səni, niyə sevirdin,
    Səni sevməyəni niyə sevirdin?

*1963*

## AXTAR SƏN MƏNİ

Əzəldən heç belə bilməzdim səni,
Qəlbimdə ilk arzu, ilk həvəs oldun.
Qışda bahar kimi
Çox gəzdim səni,
Yaz gəldi, qar kimi
Görünməz oldun.

İllər ötüb keçdi arzular təki,
İndi axşam-səhər axtar sən məni.
Qışda bahar təki,
Yazda qar təki,
Axtar sən məni,
Tapamazsan, nə qədər axtarsan məni.

*1963*

## BİRCƏ GÜNLÜK KƏPƏNƏK

O sanki günəşlə əldi cahana,
Döndü yelpazəyə zərrin qanadı.
Muncuq gözlərilə baxdı dörd yana,
Sirli möcüzəyə baxdı, doymadı.
Səma gəl-gəl dedi mavi göl kimi,
Sanki süzüb göyə indi çatacaq.
Qondu güldən-gülə, özü gül kimi.
Bir kəpənək gördü zərli, yaşıl, ağ.
Titrədi, dayandı, bu necə sirdi,
Qanadlar elə bil gəl-gəl deyirdi.
Yer özü sevgiyə bğlıdır göyə,
Torpağa doğmadır gül-çiçək eşqi,
İlahi nəğmə tək axdı ürəyə,
Kəpənək dilində kəpənək eşqi.
"Nə incə xallar var gör sevgilimdə,
Mənim övladlarım xoşbəxt olacaq!
Tanrı, yalvarıram, mənim nəslim də,
Ona oxşayaydı zərli, yaşıl, ağ"...
Coşdu sevənlərin azadə rəqsi,
Həm görüş rəqsiydi, həm vida rəqsi,
Birdən yağdı yağış, titrəşdi kollar,
Elə yağış yağdı yer-göy qovuşdu.
Çırpındı vücudu, töküldü xallar,
İslanmış qanadla o, hara uçdu?
Göz-gözü görmədi qatı buluddan,
Qısa bir ömrə də tez gəldi əcəl.
Nallı bir çəkmənin təpiyi altda.
Qovuşdu torpağa vaxtından əvvəl.
Yuxu tək gəldi o, yuxu tək getdi,
Ömürmü yaşadı fani dünyada?
Bir gün də onunçün əbədiyyətdi,
Yarımçıq qırıldı, əfsus ki, o da.
Onun qızıl nəsli, onun ağ nəsli
Həyatın qoynunda qaldı sirr kimi.

Sabah qanadlanıb, uçacaq nəsli,
Boy atır çəməndə bu gün zər kimi.
Həyatdır, ey İnsan, qəm eyləmə sən,
Səbrin gözləriylə bax, göyə, yerə.
...Sənə əbədiyyət vəd edilərkən
O nallı çəkməni gətir xatirə.

*4 noyabr 1989*

## YARIMÇIQ ZİYARƏT

Zınqırov səsləri yeri titrədir,
Karvan gedir görən, hayana sarı?
Nə qorxunc olurmuş səhra zülməti,
Sovurub hayqırır qum tufanları.
Yol hanı?
                    qum seli
                                    şütüyür yerlə,
Yox uzaq evlərin od işartısı,
Dəvələr yeriyir ağır ləpirlə,
Dəvə kövşəyində qum xırçıltısı.
Canavar gözləri yandı, közərdi,
Necə ölüm gəlir qarabaqara,
Hələ zınqırovlar sirli sipərdi,
Sürünən o həris parıltılara.
Sarban söykənərək öz çomağına,
Düşüb yorğun-yorğun yolun ağına.
Səhranın küləyi dönüb qılınca,
Bürüyür kolları qumlar təpəsi.
Zəvvarlar tələsir karvan dalınca,
Fəqət kəsilməyir ulaşma səsi.
Əynində ağ geyim sanki kəfəndir,
Onlar ölümə də məğrur gedəndir.
Necə gözlənməzdir fəlakət anı,
İnsan yerdən, göydən aman istəyir.
Səhra əjdaha tək açıb ağzını,
Gecə elə bil ki, qurban istəyir.
Kimsə inanırdı hələ səhərə...
Bəli, səhər gəldi, al səhər kimi.
Qondu təpə üstə bir alaçöhrə,
Dəvələr qum altda təpələr kimi
Qumlar ağappaqdır, kölgələr qara.
Dünyanı qoynuna lal sükut alıb.
Hardasa, uzaqda cod tikanlara,
Sarbanın papağı ilişib qalıb.

Zəvvarlar qum üstə səpələnmişdi,
Bəyaz kəfənlərə qan çilənmişdi.
Burda həyat ilə, ölüm üzləşib,
Axıb göz yaşı tək şeh kainatdan.
Mənə elə gəlir uzaq yol keçib,
Təpələr altında babamdır yatan.
Qəza niyə qılınc çalıb ki, yarəb,
Onlar axtarırkən əbədiyyəti?
...Məkkəyə beş addım qalıb ki, yarəb,
Qəbul et, yarımçıq bu ziyarəti.

*24 sentyabr 1989*

## BU GÜN ZAMAN TƏRƏZİSİ ƏYİLMİŞDİR

Bu gün zaman tərəzisi,
Olub yalan tərəzisi.
Riya, böhtan nə ağırmış yer üzündə
Tərəzinin bir gözündə həqiqətsə,
Ağ yalandır bir gözündə.
Azadlığı boğan əldən
Sızan qandır bir gözündə.
Qızıl qanlar necə ağır gəlir bu gün
Buna zaman tərəzisi necə dözsün.?
Kişi dönüb arvad olur,
Arvad kişi olur bu gün.
Dişi dönüb erkək olur,
Erkək dişi olur bu gün.
Susur sevgi pıçıltısı,
Coşur şəhvət hayqırtısı,
Ərşə çatır palanların
"Seks" adlanan laqqırtısı
Ümidlər də, arzular da gül açmamış
Solur bu gün.
Vaxtı ilə ən qiymətli
Ziyalılar, kitablardı.
İndi isə ən qiymətli
Dollar ilə hesablardır.
Gördüyümüz Məşədi İbad
Bu gün ocaq başındadır.
O seçdiyi gözəllər də
İstədiyi yaşındadır.
Şəxsiyyətin böyüklüyü pul ilə ölçülür
Bu gün.
Buna zaman tərəzisi necə dözsün?
Tərəzinin bir gözünə,
İnsanların insanlara
Kin-nifrəti qoyulmuşdur.

Tərəzinin bir gözünə
Millətlərin millətlərə
Ədavəti qoyulmuşdur.
Millət tarac olan vaxtı
Sərvəti də hərrac olur,
Qudurğanlar tox gəzərkən
Əzab çəkən el ac olur.
Qəhrəmanlıq, mehribanlıq
Yollarında zil qaranlıq,
Sevinc varsa, bir damladır,
Kədər-qəmsə bir ümmanlıq.
Hər mənzilə ayaq açır
Şəhidlərin soraqları,
Erkən sönür min-min evin çıraqları,
Solur körpə yanaqları,
Körpə dərdi çox ağırdır,
Yeri, göyü çox ağrıdır.
Əliqanlı cəlladlarsa torpaqları
Parça-parça bölür bu gün,
Buna zaman tərəzisi necə dözsün?
Sən ey əsrin tufanında
Yatən vicdan, oyan bu gün!
Müsibətlər, məşəqqətlər
Edir yaman tüğyan bu gün!
Yatən vicdan,
Oyan vicdan!
Sən insanlıq keşiyində dayan, vicdan.
Bəlkə onda ana tarix
Həqiqətdən söhbət açdı,
Bəlkə zaman tərəzisi
Elə onda tarazlaşdı...
Bu olacaq,
Görən haçaq?

*28 yanvar 1995*

## SAHİL EVİNDƏ AXŞAM

Birdən söndü işıqlar,
yer batdı qaranlığa,
Dənizdən mavi zolaq
düşdü zülmət otağa.
Bəlkə pozmayım, – deyə,
dünyanın ahəngini.
Ümmanlar gecələr də
saxlayır öz rəngini.
Qaranlığa süzülən
incə, ilahi nurdu,
Hərdən qara gözlərə
parlaq dalğa qonurdu.
Göz qırpanda elə bil
çaxırdı ani şimşək,
Zərif bir səs dinirdi, –
o xəyaldı, ya gerçək?
Bir gözəllə üzbəüz
söhbət gedir səmimi,
Aramızda qaranlıq
keçilməz yarğan kimi.
Bəzən qırıq misralar,
isidir qəlbimizi.
Sözlər qovuşursa da,
zülmət ayırır bizi.
Saatlar uzanırdı...
bayırda külək, yağış...
Qaranlığın söhbəti
nə işıqlı olarmış!
Gəldimi mehribanlıq,
Bəlkə gedir qaranlıq?
Zülmət birdən çəkildi,
Kibrit çöpü məşəldi.
Biz idik işıq verən
göyə, torpağa indi.

Hazırdıq yer üzünə
                    şəfəq saçmağa indi.
...Enirdik pillələrdən.
                    ehmal-ehmal, aramla,
Bir əl tutub əlimdən
                    bakirə ehtiramla.
Bu mənə dayaq olan
                    ürəkdimi, əldimi?
Göydən enib gəldimi?
Həsrətdi hərarətə
                    axı haçandı ürək,
Yaxşı ki, söndü işıq,
                    yaxşı ki, yandı ürək.

*17-20 dekabr 1992*

## BİR SEVGİ GƏMİSİ SAHİLƏ ÇATDI

Bir sevgi gəmisi sahilə çatdı,
Göydən bulud endi, yer kölgələndi.
...Hədiyyə vermişdim, geri qayıtdı,
Başıma dünyanın odu ələndi.
Nə üçün, qayıtdı görən hədiyyə?
Zaman dözümlüdür, insan səbirsiz.
Dedim kədərimi əl açıb göyə:
Ərmağan ürəyi bəs neyləyək biz?
Bir səhər sevginin mehi əsəndə
Ürəyim çırpındı mələk köksündə.
Demirəm ürəyi qaytarsın geri,
Məndədir bir ömrün döyüntüləri.
Bir dünya dərdi də,
Daşıyıram mən,
Söyüd deyiləm ki, əsəm, əyiləm.
İndi ürəksiz də yaşayaram mən,
Bir daha heç kəsi sevən deyiləm.
Tale qəzəb ilə
Dillənəcəkdir,
Küləklə nə gəlsə, gedər küləklə.
Ürək ürəksizə daha gərəkdir,
Bəlkə xoşbəxt ola bəxşiş ürəklə
Dönər karvan-karvan
Andlar, vədələr,
Dönər dağ da bilməz, qaya da bilməz,
Yetim xatirələr
Qayıdıb gələr,
Tapdanmış məhəbbət qayıda bilməz.

*18-29 oktyabr 1994*

## DURNALAR QAYIDANDA

Bahar yuxusundan oyadır yeri,
Artıq könül sıxmır çəndə, dumanda,
Durnalar qayıdanda.
Nə qədər arzular qayıdır geri,
Durnalar qayıdanda.

Bahar yer üzünün sevinc ayıdır,
Bulaqlar qaynayır elə bil qanda,
Durnalar qayıdanda.
Çiçəklər qayıdır, güllər qayıdır,
Durnalar qayıdanda.

Açır gözlərini dağın laləsi,
Nərgiz də üzünə gülür aranda,
Durnalar qayıdanda.
Qayıdır çayların şaqraq nəğməsi,
Durnalar qayıdanda.

Bu gün bir canlıyam, sabah torpağam,
Gör nələr düşünür insan cahanda,
Durnalar qayıdanda.
Elə bil dünyaya qayıdacağam,
Durnalar qayıdanda.
Hər bahar qayıdanda!

*1962*

## SƏNİNLƏ GETDİ

Sən mənə əlvida deyən zamanda
O doğma zaman da səninlə getdi.

Elə bil mən qaldım qərib cahanda
Mehriban cahan da səninlə getdi.

Çulğadı dünyanı bir nigaranlıq,
Görüş də, hicran da səninlə getdi.

Yer də qaranlıqdır, göy də qaranlıq,
Nurlu asimanda səninlə getdi.

Sahillər boyunca izlər də itib,
O bizim ümman da səninlə getdi.

Dünənə məhəbbət, bu günə ümid,
Sabaha güman da səninlə getdi.

*16 sentyabr 1995*

## SON TELEFON SÖHBƏTİ

***Seyfəddin Dağlının əziz xatirəsinə***

Şirmayı telefon...
                    Tanış nömrələr.
Fikrin qanadlanar,
                    Sən də uçarsan.
Ürək istəyəndə
                    elə əmr edər –
Bir anda dostunla
                    Sən qovuşarsan...
Süzüldü qəlbimə
                    İsti nəfəsi,
Eşitdim o doğma,
                    Mehriban səsi,
– Ürəyim! Yaxşıdır! Qalma nigaran!
(Bəlkə ürəyini tuturmuş bu an –
Nəbi, sən özündən muğayat ol ha...
Dünənkilər deyilik daha.
Bu necə axşamdı,
                    nə söhbətdi bu?
Kim bilir, bəlkə də vəsiyyətdi bu!
– Hə, Sona yaxşıdır. Sözümə?..Baxır...
Odur şeytan-şeytan üzümə baxır.

Elə inam vardı,
                    onun səsində,
İnam nə tez söndü
                    yer kürəsində,
– Sənə söz vermişəm gedək Xızıya...
İnşaallah, yaz gəlsin, çataq arzuya...
Nə bilim,
Keçərək
                    dağlardan iz-iz
Bu il yaz gələcək

Dünyaya sənsiz.
– Sabah gedəcəyəm xəstəxanaya...
Beş günə çıxaram... çoxu bir aya...
Bu gediş
Bəs niyə
əbədi oldu?
Sabahı buz torpaq
məbədi oldu!
...Yenə qəlbimdədir
isti nəfəsi,
Son söz yoğrulmuşdu
İlk sədaqətdən.
Mən hardan biləydim
Dostumun səsi,
O axşam
Gəlirmiş
Əbədiyyətdən?!

*1986*

## SƏNİN ÜÇÜN

Qarlı bir zirvə olsan,
Ağ buludun olaram.
Dərin xəyala dalsan,
Mən sükutun olaram.

Çəmən olsan əgər sən,
Sərin yağış çilərəm.
Əgər dənizə dönsən,
Sahilə çevrilərəm.

Qovmuşam dərdi, qəmi,
Xoşbəxtin ilki mənəm.
Səslənsən nəğmə kimi,
Sözlərin, bil ki, mənəm!

Məni susdursa zaman,
Səni özüm sanaram.
Səhər kimi oyansan,
Günəş kimi yanaram.

*1967*

## KƏHKƏŞAN

Kahkəşan gecəyə
Səf-səf düzəlib,
Sanıram, vaqifəm
Uzaq bir sirrə.
Haçansa, sənintək
Dünya gözəli,
Açıb zər kəməri
Atıb göylərə.
Mənə elə gəlir,
Baxdıqca bu an,
Hər ulduz uzaqdan
Səni səsləyir.
Sənin qamətinə
Vurğun kəhkəşan
Təzədən kəmərə
Dönmək istəyir.

*2-20 yanvar 1998*

## SƏNİ TANIDIQCA...

Sevgi çağladıqca gur ümman kimi,
Əlçatmaz olursan kəhkəşan kimi,
Bəzən də külək tək soyuq əsirsən,
Səni tanıdıqca sən mənə sirsən,
Sirlər açıldıqca sən yenə sirsən!

Bəzən günəş olub sən yandırırsan,
Bəzən də yoluma səpilən qarsan.
"Sevirəm" – sözümdən bəlkə bezirsən?
Səni tanıdıqca sən mənə sirsən.
Bu günə möcüzə, dünənə sirsən!

Bəzən erkən sönən çıraq oluram,
Yaxına gəlirəm, uzaq oluram.
Gedirəm, yolumu niyə kəsirsən?
Səni tanıdıqca sən mənə sirsən.
Sirlər açıldıqca sən yenə sirsən?

Sabaha ümidin de varmı, könlüm?
Görüşsüz doğmalıq olarmı, könlüm?
Ey ürək,
Sən eşqə qulsan, əsirsən,
Bəlkə sən özün də mənalı sirsən?
Yox, sirlər içində ən ali sirsən!

*8 mart 1998*

## ULDUZLAR VƏ SƏN

Uzaq kainatdan
Gələn nurmusan,
Gözündə ilahi
İşıqlarmıdır?
De, hansı ulduzda
Sən doğulmusan,
Yerdə sənin kimi
Gözəl varmıdır?

Bəlkə bir arzunun
Qanadıyıq biz,
Ürəklər qoşadır,
Ürəklər yalqız.
Ayın, ulduzların
Övladıyıq biz,
Bəs niyə barışmır
Ulduzlarımız?

Bəlkə doğmalarıq,
Bəlkə yadlarıq?
Bəlkə başqa-başqa
Kainatlarıq!

Yox, sən taleyimdə,
Ömrümdə varsan,
Ayrı bir ulduzda
Axtarma məni!
Vallah, sən o qədər
Cazibədarsan,
Cazibə qüvvəndən
Çıxarma məni!

Nagahan görüşlər
Keçir an kimi,
Son vermir ürəyin
İxtişaşına!

Ay Günəş başına
Dolanan kimi,
Qoy mən də dolanım
Sənin başına!

Ulduzlar ən nurlu,
Uzaq nəğmədir,
Həyatın nəğməsi
Sənin səsində.
Sənsiz yer kürəsi
Bir əfsanədir,
Yaxşı ki, sən varsan
Yer kürəsində!

*14–15 mart 1998*

## QUMARXANA

Məni düşündürür
Bu qəribə sirr.
Min zəhmət çəksə də insan qış, bahar,
Hər əkilən toxum nədənsə bitmir,
Bitir göbələk tək qumarxanalar.

Pul sanki ciblərdən
Axan bir sudur.
O, adi su deyil, bəlkə ümmandır?
Oynayan çox vaxtı milyonlar udur,
Çox vaxtı uduzan oynamayandır.

Axı, uduzanın nə vecinədir,
Məgər pullar onun cibindən gedir?

Tanrı, qoru bizi belələrindən,
De, hanı torpağa,
Yurda sədaqət?
Oynayan rahatca qalxır yerindən,
Udsa özü udur,
Uduzsa millət!

Sanki günəş qatı çənə bürünüb,
Bəşər bəlaları ürək qanadır.
Bəlkə siyasət də qumara dönüb,
Bəlkə dünya özü qumarxanadır?

*12 oktyabr 1997*

## TARİXDƏN GƏLƏN SƏS

*"Cənnət qılıncların kölgəsindədir"*
***Həzrəti Məhəmməd***

Qılınc ovxarlanıb
haçan, hansı gün?
Döyüşdə səslənib,
səslənəcəkdir.
Bəli, cənnəti də qorumaq üçün
Düşmənə od saçan qılınc gərəkdir!

Ahı ərşə çatır
Dağın aranın,
Amma başım üstdə inam tacı var.
Cənnət dediyimiz Azərbaycanın,
Qılınca ən böyük ehtiyacı var.

Satqınlıq bura yol
Açandan bəri,
Torpaq nalə çəkdi.
El darda qaldı.
Nə çoxdur tərəzi cingiltiləri,
Qılınc cingiltisi bəs harda qaldı?

Daha bəlalara
Deyək: – Əlvida!
Qılınc qığılcımı yadı dağlasın!
Qəzəb qılınc kimi iti olsa da,
El zağlı qılıncı uca saxlasın!

Bir söz əsrlərcə
Məşhur olubdur,
Qılıncı pas atan insan məğlubdur!

*11 oktyabr 1997*

## NƏ UMARSAN

Dost adına qara yaxan
Müxənnətdən nə umarsan?
Başın üstdə şimşək çaxan
Xəyanətdən nə umarsan?

Köhnə dəblər itib gedir
Şair olmaq qəbahətdir.
Şöhrət indi var-dövlətdir.
Bu şöhrətdən nə umarsan?

Sev kimlərdə sevgi varsa,
Lənət de, kim əhdi qırsa,
Əskinasa satılırsa,
Məhəbbətdən nə umarsan?

Min-min yalan eşitdim mən,
Yox riyada vəfa görən
Hər gün dondan-dona girən
Həqiqətdən nə umarsan?

Söz xalqdandır, zəhmət səndən,
Arzu eldən, sənət səndən.
Qeyrət umar millət səndən,
Sən millətdən nə umarsan?

*20 sentyabr 1997*

## ŞEİR NƏDİR MƏNİMÇÜN?

Dağlar tək ucadır, ümman tək dərin,
O, mənə qanaddır, mənə inamdır!
Sehirli səsidir o göyün, yerin,
Bir adı ölməzlik, biri ilhamdır!
Ondadır nidası qərinələrin
Cahana "əlvida", xalqa "salam"dır!
Doğma qardaşıdır əzmin, hünərin,
Şeir basılmayan məğrur qalamdır!
Şöləsi olsa da neçə min sirrin,
Şeirsiz günlərim zülmət axşamdır!
Alnımda şırımı mirvari tərin,
Ömrüm də şeirlə əriyən şamdır!
Hicranı acıdır, əzabı şirin,
Şeir mənim balam, mənim bəlamdır!
Balamdır, qalamdır, bir də inamdır!

*1-7 dekabr 1996*

# ƏLİ ÇIRAQLI

Keçdik əsrlərdən
                    sədaqət – deyə,
Səadət axtardıq əli çıraqlı.
Həm yerə bağlandıq,
                    Həm də ki, göyə,
Həqiqət axtardıq əli çıraqlı.

Nə qədər sirlidir
                    Yolları ömrün
İnsan dağlar aşır əli çıraqlı.
Necə Ay Gün üçün,
Gün də Ay üçün
Üfüqlər dolaşır əli çıraqlı!

Qəmlərə məhkumsan
                    Tənha qalınca,
Olurmu kədər də əli çıraqlı!
Əsl məhəbbətin
                    Gedir dalınca,
Əsl sevənlər də əli çıraqlı.

Milyon suallara
                    Bir cavab gəlir,
Cavab gəz, suala əli çıraqlı.
Tək əli çıraqsız dərd, əzab gəlir
Sən onu qarşıla əli çıraqlı!

Durur zirvələrin
                    Qarı saçımda,
Göylərə varıram əli çıraqlı.
Olumla ölümün
                    Yol ayrıcında
Bir dost axtarıram əli çıraqlı!

Çiynimdə əzablar
                    Ağır bir qaya
Arxamda dərdlə qəm əli çıraqlı.
Mən əli çıraqlı
                    Gəldim dünyaya.
Dünyadan gedərəm əli çıraqlı!

*16–17 noyabr 1997*

## DÜNƏNƏ

Dünən necə görüşdü?
Ürəyə çınqa düşdü.
O mehriban gülüşdü,
Yoxsa ilahi paydı?
Dünən – bu gün olaydı!

İsindim nur selindən,
Öpdüm zərif telindən.
Tutdum günəş əlindən
Bu günəş, yoxsa aydı,
Dünən – bu gün olaydı!

Nə gündüz, nə gecəydi,
Göylər yerlərə dəydi.
Bu necə möcüzəydi?
Evim nurlu saraydı,
Dünən – bu gün olaydı!

Qəlbdən nəğmə yüksəlsin,
Ah-amanlar kəsilsin.
Elə bir sabah gəlsin
Deyim dünənə taydır.
Dünən – sabah olaydı!

*15 aprel 1996*

## GÖYLƏ YER ARASINDA

Çox keçdim illərdən
Hay-harayla mən.
Durdum bu gün göylə,
yer arasında.
Bəlkə də inamsız
Bir arzuyla mən.
Qalmışam ümidsiz
Dərd arasında?

Anlar da çətindir,
Günlər də çətin.
Qəm nədir,
Günəşin
    zər tellərində?
Bəlkə də sahilsiz
Bir məhəbbətin,
Dayandım ümmansız
Sahillərində

Qoy sənin səsini
Nur kimi içim.
Bədbəxt bir ömrünçün
Sən xoşqədəmsən!
Yox, bəlkə sən mənim
Qəmli sevincim,
Bəlkə də sevincli
Bir faciəmsən?

*8 yanvar 1998*

## AY VƏ GÜN

Səni görən gündən
Dəyişdi dünyam,
Nurumu nuruna
Qata bilmirəm.
Sən parlaq Günəşsən,
Mən solğun Ayam,
İzincə gəlirəm,
Çata bilmirəm.

Şəfəqlər kainat
sinəsindədir
İşığın məndədir,
Qəlbim səndədir!

Elə bil çıxmışam
Ömrün qışından,
Yoxsa yaz qanadlı
Qaranquşam mən?
Elə bil dünyanın
yaranışından,
Sənə həsrət üçün
Doğulmuşam mən!

İsti şəfəqlərlə
Gözlər güləndə,
Təbiət qoynunda
Nur unudulur.
Axı Ay Günəşə
yaxın gələndə
Günəş də deyirlər
O gün tutulur.

Sənə yanaşsam da
Mən aram-aram,

Səni nur yolundan
            Necə saxlaram?
Ürəkdə qalacaq arzu da, kam da?
Ayam, yoxsa sönmüş
Bir çırağammı?
Səni addım-addım
Mən arasam da
haçansa mən sənə
Çatacaqammı?

*11 aprel 1999*

## BU GÜN

(*Nəğmə*)

İşıqlı ümidlər
                    Dumana döndü,
Soyuq qış nəfəsli yaz oldu bu gün.
Görüş gözləyirdim, hicrana döndü,
Mənim taleyimdən pozuldu bu gün.

Ömrümün intizar
                    Səhifəsinə
Dedim: bəlkə nurla yazıldı bu gün!
Yad tək qulaq asdım sənin səsinə,
Mənim taleyimdən pozuldu bu gün!

Bu günü necə də
                    Mən gözləyirdim,
Sevincimin ömrü az oldu bu gün.
Bu günə tanrıdan bəxşiş deyirdim,
Niyə taleyimdən pozuldu bu gün?

Vüsal işığına
                    Mən yol gedərkən,
Bir arzu həsrətə yozuldu bu gün.
Ürəyində mənəm, ürəyimdə sən,
Neçin taleyimdən pozuldu bu gün?

*7 aprel 2001*

## MİRVARİ SUYU

Dünya zinətinin
Bizik varisi,
Nələr yaşamadıq
Biz ömür boyu.
Görmüşdük həyatda
Su mirvarisi,
Bu gün hardan çıxdı
Mirvari suyu?

Dən-dən mirvarilər
            Boyunlar bəzər,
Neçin mirvariyə
            tutuldu gözlər?

Mən nə okeandım,
Nə də ümmandım,
Ki, mirvari çıxsın
Ləpələrimdən!
Mən bu mirvarini
Özüm qazandım,
Gözümdə gözüm tək
Əzizlərəm mən!

Soyuq bir dumandır
Dövlətim, varım,
Dağda da onun tək
Sis – duman olmaz.
Elə mirvaridir
Mənim mirvarim,
Ondan bəxşiş olmaz,
Ərməğan olmaz!

Gedir karvan illər
Qəm çəkə-çəkə,
Uzaq xəyallarda
Yar-yaraşıq var.

Görməmək görməkdən
Yaxşıdır bəlkə,
Bəlkə korluqda da
Parlaq işıq var?

Çökəcək dünyaya
Bir zülmətli sirr,
Kaş qismət olmasın
Bu dərd heç kəsə!
Deyirlər göz görür,
Könül də sevir,
Necə sevəcəyəm
Gözüm görməsə?

*17 aprel 1999*

## KİÇK VƏ BÖYÜK

*"Su kiçiyin, yol böyüyündür"*
***Atalar sözü***

Kiçiklər böyüyə səcdə qılmasa,
Necə dar yollardan keçilə bilər?
Əyər kiçikləri sayə salmasa,
Elə böyüklər də kiçilə bilər.

Kiçiyin çiynində ən ağır yüklər
O da ki, yorulmaz nə gündüz, gecə
Zaman tarlasında gərək böyüklər
Mehribanlıq əkib, məhəbbət biçə.

Yatır qəhrəmanlıq mehribanlıqda,
Böyük rəhim də var qəhrəmanlıqda.
Layiq yer ayırıb
                    Tale hər kəsə.
Hamı at çapmır ki, qızıl yəhərdə?
Böyük öz yerini əyər bilməsə,
Bəzən kiçik onu üstələyir də.

Keçir külək kimi
                    İl dalınca il.
Bəşər yuva tikir aranda, dağda.
Axı kiçik olmaq kiçiklik deyil,
Böyüklük deyildir böyük olmaq da.

Təkkəbbür zülmətdir,
                    sadəlik çıraq.
Talecə doğmadır böyüklə kiçik.
Haqqın şəfəqilə işıqlanaraq
Əsilzadəlikdir əsil sadəlik.

Kiçiyə su verin,
Həvəslə içsin.
Açacaq arzusu gül-çiçək sabah,
Böyüyə yol verin,
Qürurla keçsin,
Bu yoldan kiçik də keçəcək sabah.

*10 may – 1 iyun 1997*

## ƏGƏR "YOX" DEYİRSƏ...

Yaz qışa, qış yaza
                    calaşdı, bildin,
Hər günəşli gün ki, ilk yaz deyildir,
Gözün gözəllikdən qamaşdı, bildin,
Hər parlayan şüşə almas deyildir.

Ümidsiz yolların
                    uzanır hara,
Daha vida söylə son arzulara.
Cumur üzgüçülər dərin sulara
Hər suya baş vuran qəvvas deyildir.

Dalğa ol, mirvari
                    sahillərə gəl,
Sən yaxşı fikirləş sevməzdən əvvəl.
Alovlu eşqinə buz qəlbli gözəl
Əgər "yox" deyirsə –
                    Bu naz deyildir!

Hər parlayan şüşə almas – deyildir,
Sevgi nəzir deyil, niyaz deyildir.

*10 aprel 2001*

## GƏLSƏN DƏ, GƏLMƏSƏN DƏ

Çökdü qəlbə kədər, qəm,
Soyuq yellər əsəndə.
Səni gözləyəcəyəm
Gəlsən də, gəlməsən də.

Getdin, boş qaldı hücrəm,
Sözlərimdən küsəndə.
Səni gözləyəcəyəm
Gəlsən də, gəlməsən də.

Hər an səsləyəcəyəm
Hay verdin bəlkə sən də.
Səni gözləyəcəyəm
Gəlsən də, gəlməsən də.

"Əzizim" – deyəcəyəm
Qədrimi bilməsən də.
Səni gözləyəcəyəm
Gəlsən də, gəlməsən də.

*9 aprel 2001*

# O QARA GÖZLƏR

*Səhər gün tək çıxmalısan,*
*Dünya sənə əhsən desin.*
*Gözmuncuğu taxmalısan*
*Gözlərinə göz dəyməsin*!

Dinir sükutunda
                    Sehirli səslər
Qonmasın gözlərə qəm, kədər, gözəl!
Qaranlıq gecədən rəng alan gözlər
Bəs niyə nurludur bu qədər, gözəl?

Bəlkə deyilməmiş
                    Sirli bir sözəm,
Qəlbim gətirməmiş dodağa məni.
Gözəllik önündə mən ki, gücsüzəm,
Gözlərlə gəl, çəkmə sınağa məni.

Qalmasın arzuyla
                    Ümid yarıda,
Şəfəqlər üfüqdə zər nişan kimi,
Sonsuz asimanın ulduzları da
Sığınıb gözlərə kəhkəşan kimi.

Yerdən güc istərəm,
                    Səmadan kömək,
Ötüşsün ümidlə il dalınca il.
Məgər ayrılıqdır gözlərdən öpmək,
Bu Aya, ulduza qovuşmaq deyil?

Mən səni qəlbimə
                    Mehriban saydım,
Səninlə görüşdüm yaz çağında mən.
Sevincdən göylərə qanadlanaydım,
Zülmətli gözlərin işığında mən.

Həsrət də doğmadır
                    Dünya üzündə,
Yoluna zillənib gözlərim yenə.
Ömrün ağ günündə, qara günündə,
O qara gözləri gözlərəm yenə.

*3 aprel 2001*

## ÇAL-ÇAĞIR DÜNYASI

Yer göyə,
Göy isə yerə boylanır
Nə vurçatdasındır bağda, bağçada.
Sanki ölkə böyük rəqs meydanıdır,
Uşaq da oynayır, gənc də, qoca da.
            Kimsə deyir xısın-xısın:
            Aclıq olsun, keyf olsun!
Vallah, çalçağırdan
            Qulaq kar olur.
Mən heyran qalmışam tamam bu sirrə.
Qafiyəpərdazlar bəstəkar olur,
Hətta bəstəkar da dönür şairə.

Bu gün dil-dil ötür
                        Dağda, aranda
Oxumaq bacaran, bacarmayan da.

Oxusun madam ki, çox həvəsi var.
Nolar səsi yoxdur,
                        Pul kisəsi var.

Özünə ad verir biri madonna,
Başqa birisi də primadonna!

Kiməsə yol açıb qayğıkeş ölkə,
Sabah mahnı şahı söylədi bəlkə.

Kimsə – gəlsən mənə neylərsən – deyir,
Kimsə sevdiyinə ölüm diləyir.

Qalxsa məzarından Üzeyir, Qara,
Nə deyər bayağı çalçağırlara.

Günün sədasını eşitsə əgər,
Bülbül də, Fikrət də vallah, tər tökər.

Gəlib keçir illər ağır qatarla,
El bilmir nə üçün əl çalır hər gün.
Dollarla sənətdə ucalanlarla
Sənətin hörməti alçalır hər gün.

Qövr edir yaralar
        Qan sıza-sıza,
Kim bu dəbdəbədən təmannalıdır?

Bu şitlik nədəndir şadlığımıza –
Məmləkət elə bil konsert zalıdır.
        Kimsə deyir xısın-xısın:
        Aclıq olsun keyf olsun!

Bəlkə ötəcəkdir
        Bu adi meyil
Yoxsa zəncir kimi sərt həlqələrdir?
Bəlkə də nəğmələr nəğmələr deyil,
Zəlzələ günündə qəhqəhələrdir?

Fəqət səcdə edək Şövkət adına,
Qoy Zeynəb sənətin çatsın dadına!
Lüt-üryan səhnəyə çıxmaq nə lazım,
Şux geyim yaraşır əsil qadına!
Sənət yuxudasa,
                Ayıltmalıyıq,
Biz öz kökümüzə qayıtmalıyıq!

Kim ki, bu dərdlərə əncam çəkəcək,
Xalq ona qızıldan heykəl tökəcək!

*1-3 dekabr 2000*

## MÜƏMMA

Hardansa dünyaya qonaq gəlirəm,
Bəlkə də burdayam mən heç gəlmirəm.
Görmək istəyirəm, kimi bilirəm!
Sevmək istəyirəm, kimi bilmirəm!
Ötüb soyuq-soyuq günlərin min-min,
Sənin kimə sevgin, kimə eşqin var!
Nədir umacağın dünyadan sənin?
Bircə qan qusmağa qızıl teştin var!
Kimi sevməlisən bilmirsən əgər,
Sənin özünü də söylə kim sevər?

*25 noyabr 2000*

## MƏHBƏSDƏN MƏHBƏSƏ

*De, hardan gəlirsən?*
*– Dustaqxanadan!*
*De, hara gedirsən?*
*– Dustaqxanaya!*
***(Eşitdiyim söhbətdən)***

– Nolub ki, həmişə
Sən məhbəsdəsən?
– Bir dəfə "istefa" qışqırmışam mən!
– Tək səndin qışqıran?
– Mən yaxalandım,
Çoxu qaçıb getdi, mənsə dayandım!
Bir böyük məhbəs var, biri də kiçik,
Hər iki məhbəsdə bizlər bir heçik!
– Necə?
– Böyük məhbəs ölkə qədərdir
Ordan rəhim ummaq tamam hədərdir.
Mən böyük məhbəsdə adi köləyəm,
Bilmirəm, yurduma nə təhlükəyəm?
Mən burda bədbəxtəm,
Mən orda yadam,
Mən kiçik məhbəsdə daha azadam.

Doğrudan dünyada arzular haqmı?
Məhbəs qapıları açılacaqmı?

*28 noyabr 2000*

## UNUTMA

Duyğu da daşlaşar
                    Ürək daş olsa,
Suda erkən batan qəvvasa dönər.
Paxıllıq ani bir qələbə çalsa,
Cəzası bir sonsuz qisasa dönər.

Vicdan hakim olar,
                    Sənsə günahkar,
O vaxt and-amanın nə köməyi var?

Qalın cəngəllikdə əgər ki, azsan
Barı sən özünə tanış iz ara!
Əgər başqasına sən quyu qazsan
Özün düşəcəksən gec ya tez ora!

Əlbəttə dünyada
                    Bu cəza haqdır,
Kim səni quyudan çıxaracaqdır?

Buzlar da əriyib axar, unutma,
Tanrı şimşəkləri çaxar, unutma!
Namərdi yandırıb yaxar, unutma,
Etdiyin qarşına çıxar, unutma!

Deyərsən: gördüyüm
                    Nə aymış, ilmiş?
Taledən qaçmaqsa
                    Mümkün deyilmiş!

*27 noyabr 2000*

## YA VƏLVƏLƏDƏN, YA ZƏLZƏLƏDƏN

Təkcə ümidimiz
Allaha qalır,
Odlar məmləkətim odsuzdur nədən?
Günahkar bir dünya dağılmalıdır,
Ya vəlvələdən, ya zəlzələdən!

Şəlaləmi dönüb
Göz yaşlarına.
Göz yaşları axır gur şəlalədən.
Kor olar xor baxan el qubarına
Ya vəlvələdən, ya zəlzələdən!

Bəsarət bağlandı,
Aclıq yol açar,
Xalq bərəkət umar bircə tikədən.
Səma yerə enər, yer göyə uçar
Ya vəlvələdən, ya zəlzələdən!

Çəmənin
Lalələr açan vaxtı var,
Dəryalar yaranar kiçik qətrədən!
Uca bəndlərin də uçan vaxtı var,
Ya vəlvələdən, ya zəlzələdən!

*25 noyabr 2000*

## SƏNİ GÖRƏCƏYƏM HAÇAN QARABAĞ?

Doğma Qarabağım,
Söylə hardasan,
Sanki əsrlərin
Arxasındasan?

Böyük bir bəladır
Torpaq dərdimiz,
Bir yabı belində
Məndən qaçırsan!
Sənə yaxınlaşmaq
İstədikcə biz,
Elə bil sən bizdən
Uzaqlaşırsan.

Qarabağ, söz var ki,
Dərk etmirəm mən!
Axı nə söhbətdir,
Güzəşt söhbəti?
Hansı meyar ilə
Ölçülər görən
Xalqın ilk taleyi,
Son aqibəti?

Səni görəcəyəm
Haçan Qarabağ?
Yurdun həsrətlidir
Oğulu, qızı!
Torpağı güzəştə
Biz razılaşsaq,
Əvvəl güzəşt edək
Vicdanımızı!

Mən bu izdivaca
Necə inanım?
Sən ey Qarabağım
Dinim-imanım!

*16 sentyabr 2000*

## ŞAHIN QƏBULUNA DÜŞMƏK OLARMI?

Saray qapıları
Kip bağlanıbdır,
Məgər elçi daşı
Bu yerdə varmı?
Saray zirvə kimi
Tək dayanıbdır,
Şahın qəbuluna
Düşmək olarmı?

Oraya baş vurar
Kim ki, baş əyər,
Axı bacararsan,
Bunu sən məyər?

Necə düşmək olar
Saraya, düşün,
Qalın şişələr də
Sirrini gizlər.
Əyilə-əyilə
Gələnlər hər gün,
Qürurla gələnlər
Beş il də gözlər!

*16 sentyabr 2000*

## ÜFÜQDƏN ÇƏKİLSİN BULUD

Kaş yer sakitləşə,
Göy rəhmə gələ,
Gör necə çağlayır ömür dənizi!
Əvvəl tufan qopar,
sonra zəlzələ
Allah zəlzələdən saxlasın bizi.

Ey insan!
Üfüqdən çəkilsin bulud,
Qoy günəş parlasın, yollara çıxsan.
At şahə qalxanda
Cilovu bərk tut,
Cilovu buraxdın, yıxılacaqsan!

Xoş kəlam ardında
Həqiqət hanı?
İnsan da yalanı şərbət tək udur.
Kimsə-bütünlüklə
Azərbaycanı
Danabaş kəndinə bərabər tutur.

Rəhmətlə yad edək,
Mirzə Cəlili,
O, yazdı yandıqca köksündə ürək.
Bu gün biz ötərkən
Çətin yüz ili,
Vətəni bir kəndə oxşar bilməyək.

Tanrım, bağışlama,
Günah işləri,
Nə qədər çəkilər sınağa ölkə?
Çıxsa harınların
Tamah dişləri
Rahat nəfəs aldı millətim bəlkə!

Ömrüm inamımın
saflıq səsidir,
Nəmişə haq sözü nadan daşlayır,
Bu gün əyilənlər zəmanəsidir,
Yoxsa bağıranlar əsri başlayıb?

Kaş yer sakitləşə,
göy rəhmə gələ,
Gör necə çağlayır cahan dənizi!
Əvvəl tufan qopar,
sonra zəlzələ,
Allah zəlzələdən qorusun bizi!

*12–19 fevral 2000*

## ŞƏR QARIŞANDA

Dağlar dönər kölgələrə,
Qatı zülmət sərə-sərə,
Qərib axşam çökər yerə
El demiş – şər qarışanda.

Bulud gedər, şimşək çaxar,
Ay da durub qəmli baxar.
Yağış kimi ulduz yağar
Göylərlə yer qarışanda.

Arzu solar,
              xəyal olar,
Əl çatmayan vüsal olar,
Məhəbbətlər sual olar
Sevgiyə sir qarışanda.

Doğma Xəzər coşub daşar,
Dənizdə də həsrət yaşar.
İki sahil qucaqlaşar
Arazla Kür qarışanda.

Mən nə deyim əsrə, vaxta,
Özü məhrəm, sözü saxta,
Şeytanlar da çıxar taxta
Xeyirlə şər qarışanda.

Nəbi, öymə sərtliyini,
Mərd göstərər mərdliyini.
Zər itirməz zərliyini
Torpaqla zər qarışanda.

*26 fevral 2000*

## TALESİZ

Yerə kəhkəşan tək düşür izlərin,
Ümidim əlçatmaz asimanımdır
Gündüz ulduzları –
                    nurlu gözlərin,
Mənim dünya boyda çıraqbanımdır.

Yağır yay günündə soyuq yağışlar
Elə bil payızla qohumluğu var.
Durna qatarıdır – o zərif qaşlar
Payızda gedərkən məni də apar.

Sinən bəzək verir tər yasəmənə,
Kaman qaş qan töküb oxla sinəmdə,
Nolar ki, bir dəfə deyəsən mənə,
Nəbi, gəl çiçəyi, qoxla sinəmdə.

Şəfəqə boyadın yeri, göyü sən,
Sənsiz sönür sanki ay, günəş, ulduz.
Kiminsə dünyada sən taleyisən,
Mənim ki, taleyim deyilsən, əfsus!

Özümə dost bildim dərdi, möhnəti.
Söndü gözlərimdə yavaş-yavaş nur.
Fəqət, dərk elədim bir həqiqəti
Məncə əsil sevgi talesiz olur.

*15 iyun 2000*

## KÖRPÜLƏR

*"Keçmə namərd körpüsündən*
*Qoy aparsın sel səni".*
***El sözü***

İl ötdükcə,
              sıra-sıra,
Torpaq satanlar da olub.
Yer üzündən ulduzlara
Körpü atanlar da olub.

Kimdir qəlbdə nur söndükcə
Göylərə minnətə gedir.
Kimdir belə düşündükcə
Sanır ki, cənnətə gedir.

Sərilərək yer üzünə
Bənzər divlər körpüsünə.
Başlanğıcı ciblərdədir
Dönüb ciblər körpüsünə.

O kimdir dillənir belə:
– Çatsın dostuma körpülər.
Daş tikili körpülərlə
Bu nadir asma körpülər.

Gündüz yatmır,
              gecə yatmır
Fikir quş tək uçub gedir.
Qarabağa körpü çatmır
Avropanı aşıb gedir.

Haçan şimşəklər çaxacaq,
O çağlayan nə küləkdir?
Haçan yağışlar yağacaq,
Haçan sellər gələcəkdir?

Coş ay sellər,
              Daş ay sellər!
Yaxşı duysun ellər məni,
Belə körpü istəmirəm,
Qoy aparsın sellər məni!

*22–23 dekabr*

## ŞAMİ-QƏRİBAN

*Ömrünüz işıqlı olsun,*
*işığımızı söndürənlər!*

Gecədir...
    Göylərmi qarğıyıb yeri?
Zülmətə qərq olub
        şəhər, ev-eşik...
Ya orta əsrlər
        Qayıdıb geri,
Orta əsrlərə
        Ya biz getmişik?

Şikayət eləyən
        Min günah elər,
Şair, dur gecənin
        Oğlan çağında,
Çıraq işığında
        Yazıb dahilər,
Sən niyə yazmırsan
        Şam işığında?

Beləcə dövr edir
        Bugünki dövran,
Bu əsrin gözlənməz
        Həqiqətidir!
Hamıya qismətmi
        Şami – qəriban?
Seçmə adamların
        Bu qismətidir!

Çıraq əl çatmayan
        Əsrdə qalır,
O bir də qayıtmaz – sirli aləmdir!
Nə qədər istəsən
        Şam ki, tapılır,

Bəlkə şam işığı
Daha məhrəmdir?
Salma ürəyinə
Bu dərdi şair,
Bayırda şaxtadır...
Evdə soyuqdur...
Əsl şeri yazan
Kədərdir, şair,
Şam var...
Pərvanəsi hayıf ki, yoxdur.

Sabah günəş elə
ucalacaq ki...
Günəşdən qəlbində
Ocaq qalarsan!
Sətəlcəm olmusan?
Nə olacaq ki,
Allah pul yetirər,
Dərman alarsan!

Bəlkə Odlar yurdu
İşıqdan doyub?
Ümidli, ümidsiz
Bir axşamım var.
Mənim gözlərimin
yaşı quruyub
Nurlu yaş axıdan
Bir ağ şamım var.

*5 fevral 2000*

# ÖLƏN ŞEİRLƏRİMƏ FATİHƏ

*Allah sənə rəhmət eləsin S.Vurğun*

Şəxsiyyət gözlədik,
Pərəstiş gəldi.
Pərəstiş üçün də
Göstəriş gəldi.

Qaldıq pərəstişlə
Şəxs arasında.
Xeyir də yox oldu
Nəhs arasında.

Rəhbərlər adıyla
Çağladıq, coşduq,
Şəninə sifariş
Nəğməsi qoşduq.

Yandı bayraqların
Qızıl şöləsi,
Düşdü üstümüzə
Ani kölgəsi.

Güllər yerin, göyün
naxışı kimi,
Sözlər də yalanın
Yalnışı kimi.

Məntiqi itirib,
mətni səhv salan,
Xatirdə qalandır,
yaddaşda qalan.

Bəlkə bizə göylər,
Yerlər də güldü,
Rəhbər ölməmişdən,
Şeir də öldü.

Mənim bəlalardan
Ahu-zarım var,
Elə lap bu gün də
Günahlarım var.

Sızlasın misralar
mənim yerimə,
Tövbəylə qoy günah
Yanaşı olsun.

Deyirəm o, ölən
Şeirlərimə,
Qoy bir poemam da
Baş daşı olsun!

Əsrin günahıdır
Şair günahı?
Əsrin övladını
Əfv et İlahi!

*4 aprel 2000*

## ŞAİR VƏ ŞAH

(*Əfsanə*)

Vəzir qaşqabaqlı içəri girdi,
Xalçaya döşənib o salam verdi.

– Nə demək istərsən, ey sadiq insan,
Söylə nə olub ki, həyəcanlısan?

– Şairlər şairi dediniz ona,
Gərək layiq olsun şahlar şahına.

Şairlər şairi... Qibleyi aləm,
Vallah heç bilmirəm – mən necə deyəm...

Siz vurun boynumu varsa, günahım
Yerlər sizinkidir, göylər Allahın.

Allahdan yazır, o, şahı unudur.
Allahı o sizdən yuxarı tutur.

...Zər taxtın üstündə şah qurcalandı,
Elə bil gözləri qırmızı qandı.

– Yığır dövrəsinə o cavanları,
Vəsf edir ayları, asimanları.

Düzdür Allahı da unutmaq olmaz,
Şahı ilahiyə tay tutmaq olmaz!

– O böyük bəlaymış, bilməmişəm mən.
Mənim yaxşılığım gəlsin gözündən.

– Mən necə söyləyim vallah ayıbdır.
Deyəsən o burda harınlayıbdır.

Onu dinləməyə el-elat gəlir.
Məgər bunlar sizə zarafat gəlir?

Sizin əmrinizlə qibleyi-aləm,
Mən dara çəkilsəm şərəf bilərəm.
– Bəlkə birdəfəlik boynu vurulsun!
Yox, vəhşi səhraya sabah qovulsun!
Qoy gedib qurd-quşa orda yem olsun!

Rahat nəfəs aldı Vəzir bu anda.
Nur söndü sarayın otaqlarında.

...Şairlər şairi batıb qan-tərə
Üz tutdu alovlu, odlu çöllərə.
Vəhşi heyvanlara o mehman oldu,
Heyvanlar insandan mehriban oldu.
Axdı ürəyindən söz misra-misra,
Döndü mağarada daş yazılara.
Yadigar qalmaqçın bütün bəşərə!
Aylara, illərə və nəsillərə!

...Bir günsə bir xəbər çatdı səhraya;
Padişah əlvida dedi dünyaya.
Şairsə qəlbində illərin dərdi,
Şahın qəbri üstdə fatihə verdi.
O, bir çinar əkdi məzar yanında,
Gətirib su tökdü ovuclarında.

...Bir gün tufan qopdu, dəşhətli tufan!
Qumlar dəryasında çalxandı cahan.

Şah qəbri qumların altında batdı,
– Çinarsa, ucalıb göylərə çatdı.

Şair ürəyinin ədalət sözü,
Caladı işığa qara gündüzü:

"Ya Allahım,
                    ölüm unudulsa da,
Zülüm unudulmur əsla dünyada"

Dəyişir dövranlar,
                    ötür zamanlar,
Çinar səcdəsinə gəlir insanlar!

*6 aprel 2000*

## SUALSIZ CAVABLAR

– Mən behişt ətirli Lənkərandanam.
– De ki, qiyam etmiş bir məkandanam!

– Mən Qarabağlıyam, eşitsin cahan!
– Qarabağ varmı ki, qürurlanasan?

– Mənə də deyərlər igid Gəncəli,
– Ordan başlamırmı yurdun cəncəli!

– Mənə mehribandır Tovuz, Qazax da,
– Onlar uzaqdadır, qalsın uzaqda!

– Borçalı elindən gəlmişəm mən ki,...
– Xaricdə doğulan əcnəbisən ki?!

– Qəbələm paytaxdır qədim yurduma!
– Mirzə Səfər demiş: – gəl, min boynuma!

– Şəki torpağında doğulmuşam mən,
– De, Hacı dayıya dost olmuşam mən!

– Mən ki, dağ vüqarlı Kəlbəcərdənəm,
– Söylə ki, satılmış qızıl yerdənəm!

– Məndə Cəfər gücü, Müşfiq sözü var!
– Bil iki gül ilə olmayır bahar!

Bir bölgə vardır ki, onu tapın siz,
Orda doğuldunuz – bəxtəvərsiniz!

Sizindir ən uca vəzifələr də,
Adınız zər-ziba səhifələrdə.

– Demək istədim ki, Bakılıyam mən,
Demədim, bir ağrı qopdu sinəmdən.

Dünən səadətdi Bakılı olmaq,
Bu gün qəbahətdir Bakılı olmaq.

Ölkəmin hər yeri mənə əzizdir,
Çünki Vətən bizim taleyimizdir.

*Mart 2000*

## ÖMÜR GƏMİSİ

Göy şamlardan yonduğum
Bir sehirli gəmim var,
Bir balaca gəmidə
Bir dünyalıq qəmim var!
Sevdiyim gözəllərim
Gəmidə mənimlədir.
Külək döyür hiddətlə
yelkənləri inlədir.
Günəş üzlü gözəllər
Soluxub mənim kimi,
Axı illərdir gələn
Dəhşətli qənim kimi.
Onlar birgə, təkəm mən,
İllərin əzabını
Ver təbiət, çəkim mən!
Soyuq baxma, gözələ,
Qəbahətdir, təbiət!
Qəsd eləmə, gözələ,
cinayətdir, təbiət!
Kim cəza çəkməlidir
Bəşər məcəlləsilə,
Göyün şimşəklərilə,
yerin zəlzələsilə?
Gözlərdən nuru alıb,
Üzlərə qırış salıb,
Qar səpmək pak saçlara,
Bu oğru tək qəsd deyil
Qızıl-gümüş taclara?
Dor əyilir,
Tufanı
yararaq gəmi gedir,
Elə bil kainatın
Sirli aləmi gedir!

Mən bilmirəm, bilmirəm,
hayana gedir belə,
Ömrün xəyal gəmisi,
xəyal gözəllərilə?
Ağrılar ağrılardan
Ağırsa da, dözürəm,
Nuhun gəmisi kimi
Ağrı dağı gəzirəm!

*21 mart 2000*

## KÜSƏYƏN

Eşqin özündədir
Qəribə sirlər,
Məgər şirin sözdən
Küsərmi insan?
Artar küsəyənin
Payı, – deyirlər.
Sənə sevgim artır
Sən küsən zaman!

Bəzən yol açırsan
Kimsəsizliyə,
Qalıram dəryada
Tək ada kimi.
"Xudafiz" – deyirəm,
Bilmirəm niyə,
Səninçin səslənir
"Əlvida" – kimi?!

Sənə tapılarmı
Tay küsəyənim?
Qulluq edənim yox,
İş görənim yox.
Axı sən küsəndə
Ay küsəyənim,
Mənim küsü aşı
Bişirənim yox!

Eyni ürək vurur
İki sinədə,
Mənim bir sevimli
Küsəyənim var.
Səhər ayrılırıq
Axşam yenə də
Küsəyən adında
Gözləyənim var!

*11 may 1999*

## GÖRÜŞ YERİ

(*Nəğmə*)

Duyğular yol alır
Hər an ürəkdən,
Ayrılıq gününü
İl sanıb gedir.
Görüş həsrətilə
Vuran ürəkdən
Bir ümid körpüsü
Uzanıb gedir.

Könül ümmanında
Coşar tufanlar,
Sevgi vadisində
Çağlayan seldir.
Hər gün bir-birini
Görər insanlar,
Fəqət, görmək hələ
Görüş deyildir.

Eşqin ucası var,
Eşqin ulusu,
Səslənən ürəyin
Qəm telləridir.
Duyğular bizimçin
Görüş arzusu –
Xəyallar bizimçin
Görüş yeridir.

*18 may 1999*

## HARDASAN, AZIX MAĞARASI

Noldu, göy titrədi,
Yer kölgələndi?
Mərmər qayaları
Mənə göstərin!
Azıx mağarası!
Hardasan indi?
Sənin qucağına
Dönmək istərəm!

– Acmısan!
Payını oğul götür, al!
Hər kəsin bərabər
Öz payı vardı.
Tağların altında
Yanar gur tonqal
Çörəyə bükülmüş
Nur paylayardı!

Ürəklər mehriban,
Üzlər səmimi.
Pələng dərisi də
Əyinlərində.
Kölgələr dağ boyda
Heykəllər kimi –
Mağara onların
Çiyinlərində.

Hamı döyüşərdi
Yağı gələndə,
Arvadlı, uşaqlı,
Oğullu, qızlı.
İlan-çiyanlar da
Sürünüb öndə –
Düşməni vurardı,
Dostu vurmazdı!

Bu gün alov yağır
Yay gündüzündən,
Sabahkı qış bəlkə
Ölüm qışıdır?
Sivil dedikləri
Dünya üzündən,
Bir doğma mağara
Daha yaxşıdır!

Elə insan var ki,
Bu gün cahanda,
Ondan mehribandır
İlan-çiyan da.

Ürəklər nə dardır,
Səmalar geniş,
Tanrı, mağara da
Əsir düşərmiş!

Noldu, göy titrədi
Yer kölgələndi?
Doğma qayaları
Mənə göstərin!
Azıx mağarası,
Hardasan indi?
İsti qucağına
Dönmək istərəm!

Sən mənə əzizsən,
Mənə məhrəmsən,
Dünyaya açılan
Nur pəncərəmsən!

*29 avqust – 5 sentyabr 1999*

## MÜNDƏRİCAT



ŞEİRLƏR

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Ələkbər Kərimov* |
| Korrektor: | *Elmira Teymurova* |

Yığılmağa verilmişdir 12.05.2004. Çapa imzalanmışdır 26.10.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 15,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 195.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.